**əmutə fi səbilikə mudbiran, va ə'uzu bikə ən əmutə lədiğən]**

*«Allahım! Yüksəklikdən yıxılmaqdan, dağıntıdan, boğularaq və yanaraq ölməkdən Sənə sığınıram. Ölüm ayağında olarkən şeytanın məni aldatmasından Sənə pənah aparıram. Sənin yolunda döyüşərkən döyüş meydanından qaçaraq ölməkdən, ilan və ya əqrəbin çalması nəticəsində ölməkdən Sənə pənah aparıram».*[95]

**82- (( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ أَلْجُوعِ, فَإِنَّهُ بِئْسَ الْضَّجِيعُ, وَ أَعُوذُ بِكَ مِنْ أَلْخِيَانَةِ, فَإِنّهَا بِئْسَتِ الْبِطَانَةُ ))**

**82- [Allahummə inni ə'uzu bikə minəl-cu`i, fəinnəhu bi`səld-daci`u, va ə'uzu bikə minəl-xiyanəti, fəinnəhə bi`sətil-bitanətu]**

*«Allahım! Aclıqdan Sənə pənah aparıram. Aclıq nə pis yoldaşdır. Xəyanətdən Sənə pənah aparıram. Xəyanət nə pis sirdaşdır».*[96]

**83– (( اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنَ الْعَجْزِ وَالْكَسَلِ, وَالْجُبْنِ, وَالْبُخْلِ, وَالْهَرَمِ, وَالْقَسْوَةِ, وَالْغَفْلَةِ, وَالْعَيْلَةِ, وَالذِلَّةِ, وَالْمَسْكَنَةِ, وَأَعُوذُ بِكَ مِنَ الْفَقْرِ وَالْكُفْرِ وَالْفُسُوقِ وَالشِّقَاقِ وَالنِّفَاقِ وَالسُمْعَةِ**

---

*[95] Səhih Nəsai, 3/1123; Əbu Davud, 2/92.*
*[96] Əbu Davud, 2/91; Nəsai, 8/263; İbn Majə.*

وَالرِّيَاءِ وَأَعُوذُ بِكَ مِنْ الصَّمَمِ وَالبَكَمِ وَالْجُنُونِ وَالْجُذَامِ وَالْبَرَصِ وَسَيِّءِ الأَسْقَامِ ))

**83- [Allahummə inni ə‘uzu bikə minə-l-aczi va-l-kəsəli va-l-cubni va-l-buxli va-l-hərami va-l-qasvəti va-l-ğafləti va-l-‘aylәti va-z-zilləti va-l-məskənəti va ə‘uzu bikə minə-l-fəqri va-l-kufri va-l-fusuqi va-ş-şiqaqi va-n-nifə’qi va-s-sum‘əti va-r-riyə’i va ə‘uzu bikə minə-s-saməmi va-l-bəkəmi va-l-cunu’ni va-l-cuzə’mi va-l-bərasi va seyyi-il-əsqa’mi]**

*«Allahım! Acizlikdən, tənbəllikdən, qorxaqlıqdan, paxıllıqdan, qocalıq dərdindən, qəddarlıqdan, qəflətdən, kasıbçılıqdan, zəlillikdən, miskinlikdən, yoxsulluqdan, küfrdən, fasiqlikdən, ədavətdən, nifaqdan, pis tanınmaqdan (adımın çıxmasından), riyakarlıqdan, karlıqdan, lallıqdan, divanəlikdən, cüzamdan, albinizmdən və pis xəstəliklərdən Sənə sığınıram».*[97]

84– (( اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنْ الْفَقْرِ وَالْقِلَّةِ وَالذِلَّةِ وَأَعُوذُ بِكَ مِنْ أَنْ أَظْلِمَ أَوْ أُظْلَمَ ))

[97] ***Hakім və Beyhəqi.***

**84- [Allahummə inni ə‘uzu bikə minə-l-fəqri va-l-qilləti va-z-zilləti va ə‘uzu bikə min ən əzlimə əu uzləmə]**

*«Allahım! Yoxsulluqdan, qıtlıqdan, zəlillikdən, o cümlədən zalimlikdən və məzlumluqdan Sənə pənah aparıram».*[98]

**85- (( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ جَارِ السُّوءِ فِي دَارِ الْمُقَامَةِ, فَإِنَّ جَارَ الْبَادِيَةِ يَتَحَوَّلُ ))**

**85- [Allahummə inni ə‘uzu bikə min cəris-sui fi dəril-muqaməti fəinnə cərəl-bədiyəti yətəhavvalu]**

«*Allahım! Əbədilik evindəki pis qonşudan (cəhənnəmdən) Sənə sığınıram. Həqiqətən səhra [dünya] qonşusu dəyişir».*[99]

**86- (( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ قَلْبٍ لاَ يَخْشَعُ, ومِنْ دُعَاءٍ لاَ يُسْمَعُ, وَمِنْ نَفْسٍ لاَ تَشْبَعُ, وَمِنْ عِلْمٍ لاَ يَنْفَعُ أَعُوذُ بِكَ مِنْ هَؤُلاَءِ الأَرْبَعِ ))**

**86- [Allahummə inni ə‘uzu bikə min lə yəxşəu, va min du`əin lə yusmə`u, va min nəfsin lə təşbə`u, va min `ilmin lə yənfə`. Ə‘uzu bikə min həuləil-arbə`i]**

---

[98] *Nəsai, Əbu Davud, 2/91.*
[99] *Накім, 1/532; Nəsai, 8/274.*

*«Allahım! Təslim olmayan qəlbdən, eşidilməyən duadan, acgöz nəfsdən və faydasız elmdən Sənə sığınıram. Bu dörd şeydən Sənə sığınıram».*[100]

**87– (( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ يَوْمِ السُّوءِ وَمِنْ لَيْلَةِ السُّوءِ وَمِنْ سَاعَةِ السُّوءِ وَمِنْ صَاحِبِ السُّوءِ وَمِنْ جَارِ السُّوءِ فِي دَارِ الْمُقَامَةِ ))**

**87– [Allahummə inni ə'uzu bikə min yəumi-s-su'i va min leyləti-s-su'i va min sə'-'əti-s-su'i va min sahibi-s-su'i va min cə'ri-s-su'i fi də'ri-l-muqa'mə]**

*«Allahım! Pis gündən, pis gecədən, pis vaxtdan, pis dostdan və axirətdəki pis qonşudan Sənə sığınıram».*[101]

**88– (( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ الْجَنَّةَ وَأَسْتَجِيرُ بِكَ مِنَ النَّارِ ))**

**88– [Allahummə inni əs`ələkə əl-cənnətə va əstəciru bikə minən-nər]**

*«Allahım! Səndən Cənnəti diləyir və Cəhənnəm alovundan Sənə sığınıram (3 dəfə)».*[102]

**89- (( اللَّهُمَّ فَقِّهْنِي فِي الدِّينِ ))**

**89– [Allahummə fəqqihni fi-d-din]**

---

[100] *Tirмizi, 5/519; Əbu Davud, 2/92.*
[101] *Səhih əl-Jaмi, 1/411.*
[102] *Tirмizi, 4/700; İbn Majə, 1453; Nəsai.*

*«Allahım! Məni dində fəqih [elmli] et!».*[103]

90– (( اللَّهُمَّ إنِّى أعُوذُ بكَ مِنْ أشْرِكَ بِكَ وأنا أعْلَمُ، وَأسْتَغْفِرُكَ لِمَا لاَ أعْلَمُ))

**90– [Allahummə inni ə‘uzu bikə ən uşrikə bikə va ənə ə‘ləmu va əstəğfirukə limə lə ə‘ləmu]**

*«Allahım! Bilərəkdən edə biləcəyim şirkdən Sənə sığınır və bilmədən etdiklərim şirkə görə isə Səndən bağışlanma diləyirəm».*[104]

91– (( اللَّهُمَّ انْفَعْنِى بِمَا عَلَّمْتَنِى، وَعَلِّمْنِى مَا يَنْفَعُنِى، وَزِدْنِى عِلْماً ))

**91– [Allahummə-nfə‘ni bimə ‘alləmtəni va ‘allimni mə yənfə‘uni va zidni ‘ilmən]**

*«Allahım! Mənə öyrətdiklərini mənim üçün faydalı et, mənə faydası toxuna biləcək şeyləri isə mənə öyrət və elmimi artır!».*[105]

92– ( اللَّهُمَّ إنِّي أَسْأَلُكَ عِلْمًا نَافِعًا وَرِزْقًا طَيِّبًا وَعَمَلاً مُتَقَبَّلاً )

**92– [Allahummə inni əs-ələukə ‘ilmən nə’fi‘an va rizqan tayyibən va ‘amələn mutəqabbilən]**

---

***[103] Buxari (şərhlə birlikdə), 1/44; Müslim, 4/1797.***
***[104] Əhməd, 4/403.***
***[105] İbn Majə, 1/92.***

*«Allahım! Səndən faydalı bir elm, təmiz bir ruzi və məqbul bir əməl diləyirəm!».*[106]

**93- (( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ يَا أَللَّهُ بِأَنَّكَ الْوَاحِدُ الأَحَدُ, الصَّمَدُ, الَّذِي لَمْ يَلِدْ وَلَمْ يُولَدْ, وَلَمْ يَكُنْ لَهُ كُفُواً أَحَدٌ, أَنْ تَغْفِرَ لِي ذُنُوبِي, إِنَّكَ أَنْتَ الْغَفُورُ الرَّحِيمُ ))**

**93- [Allahummə inni əs`ələkə yə Allahu biənnəkə əl-vahidul-əhədu, əs-samədu, əlləzi ləm yəlid va ləm yuləd, va ləm yəkun ləhu kufuvvən əhədun, ən təğfirə li zunubi, innəkə əntəl-ğafuru-r-rahim]**

*«Allahım! Həqiqətən, Sən tək və bir [heç bir şəriki olmayan] olduğun, [heç kəsə və heç nəyə] möhtac olmadığın, doğmayıb, doğulmadığın və bənzərsiz olmağın naminə Səndən günahlarımın bağışlanmasını istəyirəm. Həqiqətən, Sən bağışlayan və rəhm edənsən!».*[107]

**94- (( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ بِأَنَّ لَكَ الْحَمْدُ, لاَ إِلَهَ إِلاَّ أَنْتَ [وَحْدَكَ لاَ شَرِيكَ لَكَ ] الْمَنَّانُ [ يَا ] بَدِيعَ السَّمَوَاتِ وَالأَرْضِ, يَا ذَا الْجَلاَلِ وَا ْلإِكْرَامْ, يَا حَيُّ يَا قَيُّومُ, إِنِّي أَسْأَلُكَ [الجَنَّةَ وَأَعُوذُ مِنَ النَّارِ] ))**

---

[106] *İbn Majə, 1298.*
[107] *Nəsai, 3/52; Əhмəd, 4/338.*

**94- [Allahummə inni əs`ələukə biənnə ləkəl-həmdu, lə iləhə illə əntə [vahdəkə lə şərikə ləkə ] əl-mənnanu [yə] bədi`ə-s-səmavati val-ardı, yə zəl-cələli val-ikram, yə həyyu yə qəyyumu, inni əs`ələukə [əl-cənnətə va ə'uzu bikə minən-nəri]**

*«Allahım! Həmdin təkcə Sənə məxsusiyyəti naminə Səndən diləyirəm. Səndən başqa ibadətə layiq haqq məbud yoxdur. [Təksən, heç bir şərikin yoxdur]. Lütfkar və səxavətlisən! Ey səmaların və yerin yaradıcısı! Ey calal, əzəmət və kəramət sahibi! Ey əbədi və əzəli olan! Səndən [Cənnəti] istəyir [və Cəhənnəm odundan Sənə sığınıram]».*[108]

**95- (( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ بِأَنِّي أَشْهَدُ أَنَّكَ أَنْتَ اللَّهُ لاَ إِلَهَ إِلاَّ أَنْتَ, الأَحَدُ, الصَّمَدُ, الَّذِي لَمْ يَلِدْ وَلَمْ يُولَدْ, وَلَمْ يَكُنْ لَهُ كُفُواً أَحَدٌ )**

**95- [Allahummə inni əs`ələukə biəni əşhədu ənnəkə əntə Allahu lə iləhə illə əntəl-əhədu, əs-samədu, əlləzi ləm yəlid va ləm yuləd, va ləm yəkun ləhu kufuvvən əhədun]**

*«Allahım! Sənin Allah olduğuna, Səndən başqa ibadətə layiq haqq məbudun olmadığına, bir olduğuna və [heç kəsə və heç nəyə] möhtac olmadığına, doğmuş*

---

[108] ***Əbu Davud, 2/80; İbn Majə; 2/1268; Nəsai, 3/52; Tirмizi, 5/550.***

*və doğulmamış olduğuna və heç bir tayın-bərabərin və bənzərinin olmadığına şəhadət verərək Səndən diləyirəm».*[109]

96- (( رَبِّ اغْفِرْلِي, وَتُبْ عَلَيَّ, إِنَّكَ أَنْتَ التَّوَّابُ الغفُورُ ))

**96- [Rabbə iğfirli, va tub aleyyə, innəkə əntə təvvabul-ğafur]**

*«Rəbbim! Məni bağışla və tövbəmi qəbul et! Həqiqətən, Sən tövbələri qəbul edən və bağışlayansan!».*[110]

97- (( اللَّهُمَّ بعِلْمِكَ الْغَيْبَ, وَقُدْرَتِكَ عَلَى الْجَلْق, أَحْيِنِي مَا عَلِمْتَ الْحَيَاةَ خَيْرًا لِى, وَتَوَفَّنِي إِذَا عَلِمتَ الوَفَاةَ خَيْرًا لِي, اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ خَشْيَتَكَ فِي الْغَيْبِ وَالْشَّهَادَةِ, وَ أَسْأَلُكَ كَلِمَةَ الْحَقِّ فِي الْرِّضَا وَالْغَضَبِ, وَأَسْأَلُكَ الْقَصْدَ فِي الْغِنَى وَالْفَقْرِ, وَأَسْأَلُكَ نَعِيماً لاَ يَنْفَدُ, وَأَسْأَلُكَ قُرَّةَ عَيْنٍ لاَ تَنْقَطِعُ, وَأَسْأَلُكَ الرِّضَا بَعْدَ الْقَضَاءِ, وَأَسْأَلُكَ بَرْدَ الْعَيْشِ بَعْدَ الْمَوْتِ, وَأَسْأَلُكَ لَذَّةَ النَّظَرِ إِلَى وَجْهِكَ, وَالشَّوْقَ إِلَى لِقَائِكَ, فِي غَيْرِضَرَّاءَ مُضِرَّةٍ, وَلاَ فِتْنَةٍ مُضِلَّةٍ, اللَّهُمَّ زَيِّنَّا بِزِينَةِ الإِيمَانِ, وَاجعَلْنَا هُدَاةً مُهْتَدِينَ ))

**97- [Allahummə biilmikəl-ğeybə, va qudratikə aləl-xəlqi, əhyini mə əlimtə əl-həyətə xəyran li, va tavaffəni izə əlimtə əl-vafətə xəyran li. Allahummə inni əs`əlukə**

---

***[109] Əbu Davud, 2/79; Tirмizi, 5/515; İbn Majə, 2/1267; Əhмəd, 5/360.***

***[110] Əbu Davud; Tirмizi.***

**xaşyətəkə fil-ğeybi vaş-şəhədəti, va əs`alukə kəlimətəl-haqqi fir-rida val-ğadabi, va əs`alukə əl-qasdə fil-ğinə val-fəqri, va əs`alukə nəimən lə yənfədu, va əs`alukə qurratə aynin lə tunfətiu, va əs`alukə ər-rida bədəl-ğadai, va əs`alukə bərdəl-iyşi bədəl-mauti, va əs`alukə ləzzətən- nəzari ilə vachikə, vaş-şauqi ilə liqaikə, fi ğeyri darrəə mudirrətin, va lə fitnətin mudillətin. Allahummə zəyyinnə bizinətil-imən, vacəlnə hudətən muhtədinə]**

*«Allahım! Qeybi bilməyin və məxluqatın üzərindəki qüdrətinlə həyatın mənim üçün xeyirli olduğunu bildiyin müddətədək məni yaşat! Ölümün mənim üçün daha xeyirli olduğunu bildiyin təqdirdə isə məni öldür! Allahım! Gizlində və aşkarda Səndən qorxmağımı diləyirəm. Allahım! Səndən əsəbi və razı qaldığım anlarda həqiqəti deməyi, zəngin və kasıb vəziyyətlərdə qənaətçil olmağı, tükənməz bir nemət, davamlı göz aydınlığı, başıma gələn qəzavü-qədərdən sonra mənə məmnunluq bəxş etməyini, ölümdən sonra rahat həyatı, mübarək camalına tamaşa etməyin ləzzətini, hər hansı zərər verici bir amilə və azdırıcı fitnəyə məruz qalmadan Sənə qovuşmağın həsrətini diləyirəm. Allahım! Bizi iman zinətilə zinətləndir və doğru yola*

*yönələnlərin hidayətinə səbəb olmuş kimsələrdən et!».*[111]

98- (( اللَّهُمَّ ارْزُقْنِي حُبَّكَ, وَحُبَّ مَنْ يَنْفَعُنِي حُبُّهُ عِنْدَكَ, اللَّهُمَّ مَا رَزَقْتَنِي مِمَّ أُحِبُّ فَاجْعَلْهُ قُوَّةً لِي فِيمَا تُحِبُّ, اللَّهُمَّ مَا زَوَيْتَ عَنِّي مِمَّا أُحِبُّ فَاجْعَلْهُ فَرَاغاً لِي فِيمَا تُحِبُّ ))

**98- [Allahummə-r-zuqni hubbəkə, va hubbə mən uhibbu fəcəlhu quvvatən li fimə tuhibbu. Allahummə mə zəvaytə ənni mimmə uhibbu fəcəlhu fərəğan li fimə tuhibbu]**

*«Ey Allahım! Mənə bəxş etdiyin sevgini Sənin sevdiklərini sevməyim üçün qüvvə verici amil et. Mənim sevmək istədiyim, amma Sənin onlardan uzaq etdiklərinin sevgisinin yerini Sənin sevdiklərinin məhəbbəti ilə doldur».*[112]

99- ((اللَّهُمَّ طهِّرنِي مِنَ الذُّنُوبِ وَالْخَطايَا, اللَّهُمَّ نَقِّنِي مِنْهَا كَمَا يُنَقَّى الثَّوبُ الأَبْيَضُ مِنَ الدَّنَس, اللَّهُمَّ طهِّرنِي بِالثَّلج وَالْبَرَدِ وَالْمَاءِ الْبَارِدِ ))

**99- [Allahummə tahhirni minəz-zunubi val-xatayə. Allahummə nəqqini minhə kəmə yunəqqə əs-savbul-**

***[111] Nəsai, 3/54, 55; Əhməd, 4/364.***
***[112] Tirmizi, 5/523.***

**əbyadu minəd-dənəsi. Allahummə tahhirni bis-səlci val-bərədi val-məil-bəridi]**

*«Allahım! Məni günah və xətalardan təmizlə! Allahım! Məni onlardan ağ paltarın ləkədən təmizləndiyi kimi təmizlə! Allahım! Məni qar, dolu və soyuq su ilə paklaşdır!».*[113]

**100- (( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الْبُخْلِ, وَالْجُبْنِ، وَسُوءِ الْعُمْرِ, وَفِتْنَةِ الصَّدْرِ, وَعَذَابِ الْقَبْرِ ))**

**100- [Allahummə inni ə'uzu bikə minə-l-buxli va-l-cubni, va sui-l-umri va fitnəti-s-sadri, va əzəbil-qabri]**

*«Allahım! Paxıllıqdan, qorxaqlıqdan, pis ömürdən [tüfeyli həyat sürməkdən], qəlb fitnəsindən və qəbr əzabından Sənə pənah aparıram!».*[114]

**101- (( اللَّهُمَّ رَبَّ جِبْرَائِيلَ, وَمِكَائِيلَ, وَرَبَّ إِسْرَافِيلَ, أَعُوذُ بِكَ مِنْ حَرِّ النَّارِ وَمِنْ عَذَابِ الْقَبْرِ ))**

**101- [Allahummə rabbə cibrəilə va mikəilə, va rəbbə israfilə, ə'uzu bikə min hərrin-nəri va min əzəbil-qabri]**

*«Cəbrayılın, Mikayılın və İsrafilin Rəbbi olan Allahım! Cəhənnəm alovunun hərarətindən və qəbr əzabından Sənə sığınıram!».*[115]

---

[113] *Tirmizi, 5/523.*
[114] *Nəsai, 8/255.*
[115] *Nəsai, 8/278.*

102– (( اللَّهُمَّ أَلْهِمْنِي رُشْدِي, وَأَعِذْنِي مِنْ شَرِّ نَفْسِي ))

**102– [Allahummə əl-həmni ruşdi, va əizni min şərri nəfsi]**

*«Allahım! Haqqı mənə öyrət, nəfsimin şərindən məni qoru!».*[116]

103– ( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ عِلْماً نَافِعاً, وَأَعُوذُ بِكَ مِنْ عِلْمٍ لا يَنْفَعُ )

**103– Allahummə inni əs`əlukə ilmən nəfiən, va ə'uzu bikə min ilmin lə yənfəu**

*«Allahım! Səndən faydalı elmi istəyir, faydasız elmdən isə Sənə sığınıram!».*[117]

104– (( اللَّهُمَّ رَبَّ السَّمَاوَاتِ [السَّبْعِ] وَرَبَّ الأَرْضِ وَرَبَّ الْعَرْشِ الْعَظِيمِ رَبَّنَا وَرَبَّ كُلِّ شَيْءٍ فَالِقَ الْحَبِّ وَالنَّوَى وَمُنْزِلَ التَّوْرَاةِ وَالإِنْجِيلِ وَالْفُرْقَانِ أَعُوذُ بِكَ مِنْ شَرِّ كُلِّ شَيْءٍ أَنْتَ آخِذٌ بِنَاصِيَتِهِ، اللَّهُمَّ أَنْتَ الأَوَّلُ فَلَيْسَ قَبْلَكَ شَيْءٍ وَأَنْتَ الآخِرُ فَلَيْسَ بَعْدَكَ شَيْءٌ وَأَنْتَ الظَّاهِرُ فَلَيْسَ فَوْقَكَ شَيْءٌ وَأَنْتَ الْبَاطِنُ فَلَيْسَ دُونَكَ شَيْءٌ اِقْضِي عَنَّا الدَّيْنَ وَأَغْنِنَا مِنَ الْفَقْرِ ))

**104– [Allahummə rabbə-s-səmə'və'ti [səbi] va rabbə-l-ardi va rabbə-l-arşi-l-'azım. Rabbənə va rabbə kulli**

---

[116] *Əhməd, 4/444; Tirmizi, 5/519.*
[117] *İbn Majə, 2/1263.*

**şey'in fə'liqa-l-həbbi va-n-nəva va munzilə-t-təura'ti va-l-inci'li va-l-furqan. Ə'uzu bikə min şərri kulli şey'in əntə ə'xizu binə'sıyətihi. Allahummə əntə-l-əvvəlu fəleysə qabləkə şey'un va əntə-l-ə'xiru fəleysə bə'dəkə şey'un va əntə-z-za'hiru fəleysə fəuqakə şey'un va əntə-l-bə'tinu fəleysə du'nəkə şey'un, iqdi 'annə-d-deynə va əğninə minə-l-fəqr]**

*«[Yeddi qat] göyün, yerin və əzəmətli ərşin Rəbbi olan Allahım! Bizim və hər şeyin Rəbbi olan, dənə və çəyirdəyi yaran, Tövratı, İncili və Fürqanı [Quranı] nazil edən Rəbbimiz! Kəklindən tutduğun hər şeyin (Hər şey Sənin mülkiyyətindədir və onu istədiyin kimi istifadə edirsən) şərindən Sənə pənah aparıram. Sən Əvvəlsən, Səndən qabaq heç bir şey olmayıb. Sən Axırsan, Səndən sonra heç bir şey olmayacaq. Sən Zahirsən, Səndən üstdə heç bir şey yoxdur. Sən Batinsən, Sənsiz heç nə yoxdur. Bizim əvəzimizə borcumuzu ödə və bizi kasıbçılıqdan çıxarıb zənginləşdir!».*[118]

**105- (( اللَّهُمَّ أَلِّفْ بَيْنَ قُلُوبِنَا, وَأَصْلِحْ ذَاتَ بَيْنِنَا, وَاهْدِنَا سُبُلَ السَّلَامِ, وَنَجِّنَا مِنَ الظُّلُمَاتِ إِلَى النُّورِ, وَجَنِّبْنَا الْفَوَا حِشَ مَا ظَهَرَ مِنْهَا وَ مَا بَطَنَ, وَبَارِكْ لَنَا فِي أَسْمَاعِنَا, وَأَبْصَارِنَا وَقُلُوبِنَا**

[118] ***Müslim, 4/2084 Əbu Hüreyrədən.***

وَ أَزْوَاجِنَا, وَذُرِّيَّاتِنَا وَتُبْ عَلَيْنَا إِنَّكَ أَنْتَ التَّوَّابُ الرَّحِيمُ وَاجْعَلْنَا شَاكِرِينَ لِنِعَمِكَ مُثْنِينَ بِهَا عَلَيْكَ قَابِلِينَ لَهَا وَأَتْمِمْهَا عَلَيْنَا ))

**105- [Allahummə əlləf beynə qulubinə va əslih zətə bəyninə vahdinə subuləs-sələmi, va nəccinə minəz-zuluməti ilən-nur, va cənnibnəl-fəva hişə mə zahəra minhə va mə batanə, va barik lənə fi əsmainə, va əbsarinə, va qulubinə, va əzvacinə, vazurriyyətinə, va tub aleynə innəkə əntə-t-təvvabu-r-rahim. Vacəlnə şəkirinə liniəmikə musninə bihə aleykə qabilinə ləhə va ətmimhə aleynə]**

*«Allahım! Ürəklərimizi birləşdir, aramızdakı münasibətləri düzəlt, bizi salamat yollara yönəlt, zülmətdən nura çıxart, bizi zahiri və batini pisliklərdən uzaq et! Eşitdiklərimizdə, gördüklərimizdə, ürəklərimizdə, zövcələrimizdə, övladlarımızda bizə xeyir-bərəkət ver! Tövbələrimizi qəbul et! Həqiqətən, Sən tövbələri qəbul edən və rəhm edənsən! Bizi nemətlərinə şükr edən, bu nemətlərlə Sənə həmd-səna oxuyan, onları qəbul edən kəslər et və bizə olan nemətlərini başa çatdır!».*[119]

**106- (( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ خَيْرَ الْمَسْأَلَةِ, وَخَيْرَ الدُّعَاءِ, وَخَيْرَ النَّجَاحِ, وَخَيْرَ الْعَمَلِ, وَخَيْرَ الثَّوَابِ وَخَيْرَ الْحَيَاةِ, وَخَيْرَ**

---

[119] ***Hakim. Hədis Müslimin şərtlərinə görə səhih hesab olunur.***

الْمَمَاتِ, وَثَبِّتْنِي وَثَقِّلْ مَوَازِينِي, وَحَقِّقْ إِيْمَانِي, وَارفَعْ دَرَجَاتِي, وَتَقَبَّلْ صَلاَتِي, وَاغْفِر خَطِيئَتِي, وَأَسْأَلُكَ الدَّرَجَاتِ الْعُلَى مِنَ الْجَنَّةِ, اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ فَوَاتِحَ الْخَيْرِ, وَخَوَاتِمَهُ, وَجَوَامِعَهُ, وَأَوَّلَهُ, وَظَاهِرَهُ, وَبَاطِنَهُ, وَالدَّرَجَاتِ الْعُلَى مِنَ الْجَنَّةِ آمِينْ . اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ خَيْرَ مَا آتِي, وَ خَيْرَ مَا أَفْعَلُ, وَ خَيْرَ مَا أَعْمَلُ, وَ خَيْرَ مَا بَطَنَ وَ خَيْرَ مَا ظَهَرَ, وَالدَّرَجَاتِ الْعُلَى مِنَ الْجَنَّةِ آمِينْ . اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ أَنْ تَرْفَعَ ذِكْرِي, وَتَضَعَ وِزْرِي, وَتُصْلِحَ أَمْرِي, وَتُطَهِّرَ قَلْبِي, وَتُحَصِّنَ فَرْجِي, وَتُنَوَّرَ قَلْبِي, وَتَغْفِرَ لِي ذَنْبِي, وَأَسْأَلُكَ الدَّرَجَاتِ الْعُلَى مِنَ الْجَنَّةِ آمِينْ. اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ أَنْ تُبَرِكَ فِي نَفْسِي, وَفِي سَمْعِي, وَبَصَرِي, وَفِي رُوحِي, وَفِي جَلْقِي, وَفِي جُلُقِي, وَفِي أَهْلِي, وَفِي مَحْيَايَ, وَفِي مَمَاتِي, وَفِي عَمَلِي, فَتَقَبَّلْ حَسَنَاتِي, وَأَسْأَلُكَ الدَّرَجَاتِ الْعُلَى مِنَ الْجَنَّةِ آمِينْ ))

106-[Allahummə inni əs`əlukə xəyral-məs`ələti, va xəyrad-duəi, va xəyran-nəcəhi, va xəyral-əməli, va xəyras-səvabi, va xəyral-həyati, va xəyral-məməti. Va səbbitnəi, va səqqil məvazini, va həqqiq iyməni, varfəu dərracəti, va təqəbbəl salati, vağfir xatiəti, va əs`əlukəd-dərəcətil-ulə minəl-cənnəti. Allahummə inni əs`əlukə fəvatihəl-xeyri, va xavatiməhu, va cəvamiəhu, va əvvaləhu, va zahirəhu, va batinəhu vad-dərəcətil-ulə minəl-cənnəti. Amin! Allahummə inni ə`səlukə xəyra mə ati, va xəyra mə əf`əlu, va xəyra mə ə`əməlu va xəyra mə batanə, va xəyra mə zaharə, vad-dərəcətil-ulə minəl-cənnəti. Amin! Allahummə inni əs`əlukə ən tərfəu zikri, va tadaə vizri, va tuslihə əmri, va tutahhirə

**qalbi, va tuhəssinə fərci, va tunəvvira qalbi, va təğfirə li zənbi, va əs`əlukəd-dərəcətil-ulə minəl-cənnəti. Amin! Allahummə inni əs`əlukə ən tubarik fi nəfsi, va fi səm`i va fi basari, va fi ruhi, va fi xəlqi, va fi xuluqi, va fi əhli, va fi məhyəyə, va fi məməti, va fi əməli, fətəqəbbəl həsənəti, va əs`əlukəd-dərəcətil-ulə minəl-cənnəti. Amin!]**

*«Allahım! Səndən diləklərin, duaların, müvəffəqiyyətlərin, əməllərin, mükafatların [savabların], həyatın, ölümün ən xeyirlisini diləyirəm. Məni möhkəm və sabitqədəm et! Çəkimi (savabımı) ağırlaşdır, imanımı gerçəkləşdir, dərəcələrimi yüksəlt, namazımı qəbul et, günahlarımı bağışla! Səndən Cənnətin ən yüksək zirvələrini istəyirəm. Allahım! Səndən xeyrin başlanğıcını, sonunu, hamısını, əvvəlini, zahirdə və batində olanını və Cənnətin ən yüksək zirvələrini istəyirəm. Amin! Allahım! Səndən gəlməyimin, etdiyimin xeyrini, batində və zahirdə olanların xeyrini və Cənnətin ən yüksək zirvələrini istəyirəm. Amin! Allahım! Səndən ad-sanımı ucaltmağını, yükümü götürməyini, işlərimi səhmana salmağını, qəlbimi təmizləməyini, zinadan qorumağını, qəlbimi nurlandırmağını, günahlarımı bağışlamağını və Cənnətin ən yüksək zirvələrini istəyirəm. Amin! Allahım! Canımda, eşitməyimdə, görməyimdə,*

*ruhumda, xilqətimdə, əxlaqımda, ailəmdə, yaşayışımda, ölümümdə və əməlimdə xeyir-bərək ver! Yaxşılıqlarımı qəbul et və mənə Cənnətin ən yüksək zirvələrini nəsib et. Amin!».*[120]

**107- (( اللَّهُمَّ جَنِّبْنِي مُنْكَرَاتِ الأَخْلاَقِ, وَالأَهْوَاءِ, وَالأَعْمَالِ, وَالأَدْوَاءِ ))**

**107- [Allahummə cənnibnə munkəratil-əxlaqi, val-əhvai, val-ə`əməli, val-ədvai]**

*«Allahım! Məni əxlaqsızlıqdan, pis istək və ehtiraslardan, ədəbsiz əməllərdən və pis xəstəliklərdən qoru!»*[121]

**108- (( اللَّهُمَّ قَنِّعْنِي بِمَا رَزَقْتَنِي, وَبَارِكْ لِي فِيهِ, وَاخْلُفْ عَلَيَّ كُلَّ غَائِبَةٍ لِي بِخَيْرٍ ))**

**108- [Allahummə qanni`ini bimə razəqtani, va barik li fihi, vax-luf aleyyə kullə ğaibətin li bixeyrin]**

*«Allahım məni ruziləndirdiyinlə qənaətləndir və onu bərəkətli et! Hər bir itirdiyimin əvəzinə daha da xeyirlisini mənə nəsib et!».*[122]

---

[120] ***Hədisi Haкім Uмм Sələмə yolu ilə Peyğəмbərdən rəvayəм eммişdir.***
[121] ***Haкім. Hədis Müslimin şərмlərinə görə səhih hesab olunur.***
[122] ***Haкімə görə səhihdir; əz-Zəhəbi bununla razılaşıb, 1/510.***

109– (( اللَّهُمَّ حَاسِبْنِى حِسَاباً يَسِيراً ))

**109– [Allahummə həsibni hisəbən yəsira]**

*«Allahım! Mənimlə yüngül haqq-hesab çək!».*[123]

110- ((اللَّهُمَّ أعِنَّا عَلَى ذِكْرِكَ, شُكْرِكَ, وَحُسْنِ عِبَادَتِكَ ))

**110– [Allahummə əinni alə zikrikə,va şukrikə, va husni ibadətik]**

*«Allahım! Səni zikr etmək, Sənə şükr etmək və Sənə layiqincə ibadət etmək üçün bizə yardım etmək!».*[124]

111- (( اللَّهُمَّ إنِّي أسْألُكَ إيْمَاناً لاَ يَرْتَدُّ, وَنَعِيماً لا يَنْفَدُ, وَمُرَافقة مُحَمَّدٍ فِي أعْلَى جَنَّةِ الْخُلْدِ ))

**111– [Allahummə inni əs`əlukə iymənən lə yərtəddu, va nəimən lə yənfədu, va murafəqatə Muhəmmədin fi ə`əla cənnətil-xuld]**

*«Allahım! Səndən tərəddüdsüz iman, tükənməz nemət və əbədi Cənnətin ən yüksək qatında Məhəmmədin -sallallahu aleyhi və səlləm- yanında olmağı istəyirəm».*[125]

---

*[123] Əhməd, 8/48, Hakim, 1/255.*
*[124] Hakim, 1/499, Əbu Davud, 2/86, Nəsai, 3/53.*
*[125] İbn Hibban (Məvarid) Səh. 604, Əhməd, 1/386, 400, Nəsai.*

112– ((اللَّهُمَّ قِنِي شَرَّ نَفْسِي, وَاعْزِمْ لِي عَلَي أَرْشَدِ, اللَّهُمَّ اغْفِرْ لِي مَا أَسْرَرْتُ, وَمَا أَعْلَنْتُ, وَمَا أَخْطَأْتُ, وَمَا عَمَدْتُ, وَمَا عَلِمْتُ, وَمَا جَهِلْتُ ))

**112– [Allahummə qini şərrə nəfsi, va`əzim li alə ərşədi əmri. Allahummə-ğ-firli mə əsrartu, va iə ə`ələntu va mə əxta'tu, va mə əmədtu, va mə əməltu,va mə cəhiltu]**

*«Allahım! Məni nəfsimin şərindən qoru, ən doğru işimdə məni qətiyyətli et! Gizlində və aşkarda, səhvən və qəsdən, həmçinin bilərəkdən və bilməyərəkdən etdiyim günahlarımı bağışla!».*[126]

113– (( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ غَلَبَةِ الدَّيْنِ, وَغَلَبَةِ الْعَدُوِّ, وَشَمَاتَةِ الأَعْدَاءِ ))

**113– [Allahummə inni ə'uzu bikə min ğələbəti-d-dəyni, va ğələbətil-uduvvi, va şəmətətil-ə`ədəi]**

*«Allahım! Borc dərdindən, düşmənin bizdən yüksəkdə olmasından və bədbəxtliyimizə sevinməsindən Sənə sığınıram».*[127]

114– (( اللَّهُمَّ اغْفِرْ لِي, وَاهْدِنِي, وَارْزُقْنِي, وَعَافِنِي, أَعُوذُ بِاللَّهِ مِنْ ضِيقِ الْمُقَامِ يَوْمَ الْقِيَامَةِ ))

---

[126] *Hakim, 1/510; Əhməd, 4/444.*
[127] *Nəsai, 8/265.*

**114- [Allahummə-ğ-firli, vahdini, varzuqni, vaəfini, ə'uzu billəhi min dıqil-muqami yaumәl-qiyamə]**

*«Allahım! Məni bağışla, doğru yola yönəlt, mənə ruzi və cansağlığı bəxş et! Qiyamət günü qaldığım yerin darısqallığından Allaha pənah aparıram».*[128]

**115- (( اللَّهُمَّ مَتِّعْنِي بِسَمْعِي, وَبَصَرِي, وَاجْعَلْهُمَا الوَارِثَ مِنِّي, وَانْصُرْنِي عَلَى مَنْ يَظْلِمُنِي, وَخُذْ مِنْهُ بِثَأْرِي ))**

**115- [Allahummə mətti`ini bisəm`i, va basari, vacəlhumə əl-varisə minni, vansurni alə mən yəzlimuni, va xuz minhu bisə'ri]**

*«Allahım! Məni eşitmə və görmə qabiliyyətim ilə mükafatlandır. Mənə zülm edənlər üzərində qələbə çalmaqda mənə kömək ol və onlardan intiqamımı al!».*[129]

**116- (( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ عِيشَةً نَقِيَّةً, وَمَيْتَةً سَوِيَّةً, وَمَرَدّاً غَيْرَ مُخْزٍ وَلاَ فَاضِحٍ ))**

**116- [Allahummə inni əs'əlukə işətən nəqiyyətən, va məytətənsəviyyətən, va mərəddən ğəyra muxzin va lə fədih]**

*«Allahım! Səndən Allaha itaət və ibadət altında keçirilən həyat tərzi, düzgün ölüm, rüsvayedici və biabırçı olmayan qayıdış yeri istəyirəm».*[130]

---

[128] *Nəsai, 3/209; İbn Majə, 1/431 və b.*
[129] *Tirмizi, 3/188; Hакім, 1/523.*
[130] *«Zəvaid мüsnəd əl-bəzzar», 2/442 (2177), Təbərani.*

117- (( اللَّهُمَّ لَكَ الْحَمْدُ كُلُّهُ, اللَّهُمَّ لاَ قَابِضَ لِمَا بَسَطْتَ, وَلاَ بَاسِطَ لِمَا قَبَضْتَ, وَلاَهَادِيَ لِمَنْ أَضْلَلْتَ وَلاَ مُضِلَّ لِمَن هَدَيْتَ, وَلاَ مُعْطِيَ لِمَا مَنَعْتَ وَلاَ مَانِعَ لِمَا أَعْطَيْتَ, وَلاَ مُقَرِّبَ لِمَا بَاعَدْتَ, وَلاَ مُبَاعِدَ لِمَا قَرَّبْتَ, اللَّهُمَّ ابْسُطْ عَلَيْنَا مِنْ بَرَكَاتِكَ وَرَحْمَتِكَ وَ فَضْلِكَ وَرِزْقِكَ, اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ النَّعِيمَ الْمُقِيمَ الَّذِي لاَ يَحُولُ وَلاَيَزُولُ, اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ النَّعِيمَ يَوْمَ العَيْلَةِ, وَالأَمْنَ يَوْمَ الْخَوْفِ, اللَّهُمَّ إِنِّي عَائِذٌ بِكَ مِنْ شَرِّ مَا أَعْطَيْتَنَا وَ شَرِّ مَا مَنَعْتَنَا, اللَّهُمَّ حَبِّبْ إِلَيْنَا الإِيمَانَ وَزَيِّنْهُ فِي قُلُوبِنَا وَكَرِّهْ إِلَيْنَا الْكُفْرَ وَالْفُسُوقَ وَالْعِصْيَانَ وَاجْعَلْنَا مِنَ الرَّاشِدِينَ. اللَّهُمَّ تَوَفَّنَا مُسْلِمِينَ, وَأَحْيِنَا مُسْلِمِينَ وَأَلْحِقْنَا بِالصَّ الِحِينَ غَيْرَ خَزَايَا وَلاَ مَفْتُونِينَ, اللَّهُمَّ قَاتِلِ الْكَفَرَةَ الَّذِينَ يُكَذِّبُونَ رُسُلَكَ وَيَصُدُّونَ عَنْ سَبِيلِكَ, وَاجْعَلْ عَلَيْهِم رِجْزَكَ وَعَذَابَكَ, اللَّهُمَّ قَاتِلِ الْكَفَرَةَ الَّذِينَ أُوتُو الْكِتَابَ إِلَهَ الحَقِّ [آمِينْ] ))

117- [Allahummə ləkəl-həmdu kulluhu. Allahummə lə qabida limə bəsəttu va lə bəsitə limə qabədtu, va lə hədiyə limən ədləltu va lə mudillə limən hədəytu, va lə mutiyə limə mənə`ətə va lə məniə limə ə`atəytə, va ləmuqarribə limə bəədtə, va lə mubəidə limə qarrəbtə. Allahummə-b-sut aləynə min bərəkətikə va rahmətikə va fadlikə va rizqikə. Allahummə inni əs'əlukən-nəiəməl-muqiməl-ləzi lə yəhulu va lə yəzulu. Allahummə inni əs'əlukən-nəimə yauməl-əyləti, val-əmnə yauməl-xaufi. Allahummə inni əizun bikə min şərri mə ətaytənə va şərri mə mənə'ətənə. Allahummə həbbib iləynəl-iymənə va zəyyinhu fi qulubinə va kərrihu iləynə əl-kufrə val-fusuqə val-isyənə vac`əlnə minər-raşidinə. Allahummə təvaffənə musliminə, va əhyinə musliminə, vaəlhiqnə bis-salihinə ğəyra xəzəyə va lə məftuninə. Allahummə qatili-l-kəfərətə-l-ləzinə yukəzzibunə rusulukə va yəsuddunə ən səbilikə, vacəl

**aləyhim riczəkə va azəbəkə. Allahummə qatili-l-kəfərətə-l-ləzinə utul-kitəbə, iləhə-l-haqqi. [Amin!]]**

*«Allahım! Həmd bütünlüklə Sənə məxsusdur. Allahım! Sənin döşədiyini heç kəs bükə bilməz, bükdüyünü isə heç kəs döşəyə bilməz. Sənin azdırdığını heç kəs haqq yoluna yönəldə bilməz, haqq yoluna yönəltdiyini isə heç kəs azdıra bilməz. Vermədiyini verə biləcək, verdiyinə isə mane ola biləcək heç kəs yoxdur. Uzaqlaşdırdığını yaxınlaşdıracaq, yaxınlaşdırdığını isə uzaqlaşdıra biləcək heç bir qüvvə yoxdur. Allahım! Bərəkət, rəhmət, fəzilət və ruzi qapısını üzümüzə aç! Allahım! Səndən, üz çevirməyən və sabit qalan real xoşbəxtlik diləyirəm. Allahım! Səndən kasıbçılıq günündə xoşbəxtlik, qorxu içində yaşadığımız gündə isə əmin-amanlıq diləyirəm. Allahım! Verdiyinin və vermədiyinin şərindən Sənə pənah aparıram. Allahım! Bizdə imana qarşı məhəbbət oyat və qəlblərimizi onunla zinətləndir! Həmçinin bizdə küfrə, fasiqliyə və asiliyə qarşı nifrət oyat və bizi doğru yolun yolçularından et! Allahım! Bizi müsəlman kimi öldür və müsəlman kimi dirilt! Bizi xəcalətli və divanə bir halda deyil, üzüağ və ağıllı bir vəziyyətdə əməlisalehlərə qovuşdur. Allahım! Elçilərini təkzib edən və düz yoldan sapdıran kafirlərə qarşı mübarizə apar! Onları Öz cəzana və əzabına düçar et! Allahım! Kitab verilən (və ona əməl etməyən) kafirlərə qarşı mübarizə apar! Ey Haqq olan Allah! [Amin!]».*[131]

**118- (( اللَّهُمَّ اغْفِرْ لِي, وَارْحَمْنِي وَاهْدِنِي, و َعَافِنِي, وَارْزُقْنِي )) (( وَاجْبُرْنِي وَارْفَعْنِي ))**

**118- [Allahummə-ğ-fir li, varhəmni, vahdini, vaəfini, varzuqni] [vacburni, varfə`əni]**

---

[131] *Əhməd, 3/424; Haкiм, 1/507, 3/23-24; Buxari.*

*«Allahım! Məni bağışla! Mənə rəhm et! Məni doğru yola yönəlt! Mənə cansağlığı və ruzi bəxş et"!*[132] *«Məni islah et və ucalt!».*[133]

119- (( اللَّهُمَّ زِدْنَا وَلاَ تَنْقُصْنَا, وَأَكْرِمْنَا وَلاَ تُهِنَّا, وَأَعْطِنَا وَلاَ تَحْرِمْنَا, وَآثِرْنَا وَلاَتُؤْثِرْنَا عَلَيْنَا, وَأَرْضِنَا وَارْضَ عَنَّا ))

**119- [Allahummə zidnə va lə tənqusnə, va əkrimnə va lə tuhinnə, va ə`ətinə va lə təhrimnə, va əsirnə va lə tu'sir aleynə, va ərdınə vardə ənnə]**

*«Allahım! Bizə (yaxşılıqları, nemətləri) artır, əksiltmə! Bizə hörmət et, bizi alçaltma! Bizə bəxş et, bizi məhrum etmə! Bizi üstün tut, bizdən üstün tutma! Bizi razı sal, bizdən qal»!.*[134]

120- (( اللَّهُمَّ أَحْسَنْتَ خَلْقِي فَأَحْسِنْ خُلُقِي ))

**120- [Allahummə əhsəntə xalqi fə-əhsin xuluqi]**

*«Allahım! Mənim yaradılışımı gözəl etdin, əxlaqımı da gözəl et!».*[135]

121- (( اللَّهُمَّ ثَبِّتْنِي وَاجْعَلْنِي هَادِياً مَهْدِيّاً ))

**121-[ Allahummə səbbitni vacəlni hədiyən məhdiyyən]**

*«Allahım! Məni sabitqədəm et və haqq yoluna yönəldən və o yolun yolçusu et!».*[136]

---

*[132] Müslim, 4/2072-2073, 4/2078.*
*[133] Səhih İbn Majə, 1/148; Səhih Tirmizi, 1/90.*
*[134] Tirmizi, 5/326 (3173); Hakim, 2/98.*
*[135] Əhməd, 6/68, 155, 1/403.*
*[136] Buxari (şərhlə bir yerdə), 6/161.*

122– ( اللَّهُمَّ اَتِنِي الْحِكْمَةَ الَّتِي مَنْ أُوتِيَهَا فَقَدْ أُوتِيَ خَيْراً كَثِيراً)

**122– [Allahummə atinil-hikmətə-l-ləti mən utiyəhə fəqəd utiyə xəyran kəsiran]**

*«Allahım! Mənə hikmət [elm, mərifət, müdriklik] bəxş et, özü də elə bir hikmət ki, o kimə bəxş edilmişsə, ona çoxlu xeyir verilmişdir».*[137]

Sonda peyğəmbərimiz Məhəmmədə *–sallallahu aleyhi və səlləm–*, onun ailəsinə, əshabələrinə və Qiyamətə qədər onun yolunu layiqincə davam etdirənlərə Allahın salamı və xeyir-duası olsun deyirik.

---

***[137] Allah-maala bu barədə buyurur: «Allah istədiyi şəxsə hikmət [elm, mərifət, müdriklik] bəxş edər. Kimə hikmət bəxş edilmişsə, ona çoxlu xeyir [əbədi səadət] verilmişdir...». əl-Bəqərə, 269.***

# العِلاج بارُّقيَ

مِن الْكِتَابِ وَالسُّنَّة

QURAN VƏ SÜNNƏDƏN İSTİFADƏ ETMƏKLƏ

# OVSUNLA MÜALİCƏ

*Rəhmli və mərhəmətli Allahın adı ilə!*

## Quran və Sünnədən istifadə etməklə aparılan müalicənin əhəmiyyəti

Həmd ancaq Allaha məxsusdur. Ona həmd edir, ancaq Ondan yardım və bağışlanma diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Ona sığınırıq. Allahın haqq yoluna yönəltdiyi kəsi heç kim azdıra bilməz, Onun azdırdığı kəsi isə heç kim haqq yoluna yönəldə bilməz. Allahdan başqa ibadətə layiq haqq məbudun olmamasına şəhadət verirəm. O təkdir və şəriki yoxdur və şəhadət verirəm ki, Məhəmməd onun qulu və elçisidir. Həmçinin peyğəmbərimiz Məhəmmədə *-səllallahu aleyhi və səlləm-*, onun ailəsinə, əshabələrinə və Qiyamətə qədər onun yolunu layiqincə davam etdirənlərə Allahın salamı və xeyir-duası olsun deyirəm.

Heç bir şübhə yoxdur ki, Qurani-Kərim və Peyğəmbərdən *-səllallahu aleyhi və səlləm-* ovsunla müalicə barədə nəql olunan dua və zikrlərdən istifadə etməklə aparılan müalicə ən xeyirli müalicə və tam bir şəfadır. Bunu aşağıdakı ayələr də təsdiq edir. Belə ki, Allah-taala buyurur:

**«[Ya Məhəmməd!] De ki: «O, iman gətirənlərə hidayətdir və [cəhalət xəstəliyinə tutulmuş ürəklərə] şəfadır».**[138] Digər bir ayədə isə belə deyilir:

**«Biz, Qurandan möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik».**[139] Ayələrdən də göründüyü kimi Quran bütünlüklə bir şəfadır və bu barədə Allah-taala başqa bir ayəsində belə deyir:

**«[Ey insanlar!] Sizə Rəbbinizdən bir öyüd-nəsihət , ürəklərdə olana [cəhalətə, şəkk-şübhəyə, nifaqa] bir şəfa, möminlərə hidayət və mərhəmət [Quran] gəlmişdir!»**[140]

Quran bütün qəlb və bədən, dünya və axirət xəstəliklərinin tam bir şəfasıdır. Lakin Qurani-Kərimdən istifadə etməklə şəfa istəmək hər bir kəsin bacardığı və müvəffəq olduğu bir iş deyil. Əgər xəstə Qurandan istifadə etməklə yaxşı müalicə olunsa, yaxud onun vasitəsilə öz xəstəliyini sidq ürəklə, imanla, qəbul olunacağına tam ümüd bəsləyərək, qəti etiqadla və şərtlərinə riayət edərək müalicə etsə, sözsüz ki, heç bir xəstəlik onun [Qurana] qarşısında əsla tab gətirə bilməz. Axı necə ola bilər ki, xəstəliklər

---

[138] *Fussiləm, 44.*
[139] *əl-İsra, 82.*
[140] *Yunus, 57.*

yer və göyün Rəbbinin kəlamından təsirlənməsin və onun qarşısında tab gətirə bilsin?! Özü də elə bir kəlam ki, əgər Allah-taala onu dağlara və yerə nazil etsəydi, onları parça-parça edərdi. Elə bir qəlb və ya bədən xəstəliyi tapılmaz ki, Quranda Allahın Öz kitabını anlamaqdan ötəri fəhm bəxş etdiyi kəslər üçün onların müalicə üsulu, əmələ gəlmə səbəbləri və onlardan qorunmağın üsulu olmasın. Uca və böyük Allah Quranda qəlb və bədən xəstəliklərini və onların müalicəsini qeyd etmişdir. Qəlb xəstəlikləri iki növə bölünür. Birincisi, şəkk-şübhə xəstəliyi, ikincisi isə şəhvət və azğınlıq xəstəliyidir. Bütün nöqsanlardan uzaq olan Allah müfəssəl olaraq həm qəlb xəstəliklərini, həm xəstəliklərin yaranma səbəblərini, həm də bu xəstəliklərin müalicə üsulunu qeyd edir. O, bu barədə belə deyir:

**«Məgər müşriklərə oxunmaqda olan kitabı sənə nazil etməyimiz onlara kifayət etmədimi? Həqiqətən, bunda iman gətirən bir tayfa üçün həm mərhəmət, həm də ibrət vardır!».**[141] Dahi alim İbn əl-Qeyyim -*Allah ona rəhmət eləsin!*- demişdir: “Quranın şəfa vermədiyinə Allah da şəfa verməz, Quranın kifayət etmədiyinə Allah da kifayət etmə”.[142]

---

[141] ***əl-Ənкəbum, 51.***
[142] ***“Zəd əl-Məad”, 4/352.***

Bədən xəstəliklərinə gəldikdə isə Quran onun müalicəsinin üsul və qaydalarını göstərmiş və bu bədən xəstəliklərinin müalicə qaydaları bütünlüklə Qurani-Kərimdə öz əksini tapmışdır. Bunlar üçdür: səhhəti qorumaq, zərərli amillərdən çəkinmək, bədəni zərərli və əziyyət verici maddələrdən təmizləmək və bununla da bu növə aid olan digərlərini də göstərmək, bəyan etmək.[143]

Əgər bəndə Qurandan istifadə etməklə özünü düzgün müalicə etsə, bunun tez bir müddətdə şəfa tapmasına göstərdiyi möcüzəvi təsirin şahidi olar. Dahi alim imam İbn əl-Qeyyim *-Allah ona rəhmət eləsin!-* demişdir: "Bir müddət Məkkədə qaldım. Orada naxoşladım. Nə həkim, nə də dava-dərman tapa bildim. Özümü əl-Fatihə surəsilə müalicə edirdim. Bunun da möcüzəvi təsirini görürdüm. Bir az Zəm-zəm suyu götürür, dəfələrlə ona oxuyub sonra da içirdim. Beləliklə də tam sağaldım. Sonralar bir çox ağrıları müalicə edərkən bu üsula əsaslanır və bunun da son dərəcə faydasını görürdüm. Ağrıdan şikayətlənənlərə bu müalicə üslubunu tövsiyə edirdim. Əksəriyyəti də tez bir müddətdə sağalırdı".[144]

---

***[143] Bax: "Zəd əl-Məad", 4/352 və 4/6.***
***[144] "Zəd əl-Məad", 4/178; "əl-Javab əl-Kafi", səh. 21.***

Peyğəmbər üsulu ilə aparılan müalicə ən xeyirli dəvadır. Dua qəbul olunmasına əngəl olan amillərdən uzaq olduğu və bu dualarda israr özünü göstərdiyi təqdirdə arzu olunmayan hərəkətlərin dəf olunmasında, istənilən şeylərin isə əldə olunmasında ən xeyirli amil və ən faydalı dəvadır. O həmçinin bəlanın düşmənidir, onu dəf edir və ondan müalicə edir. Dua bəlanın nazil olmasının qarşısını alan, nazil olduğu təqdirdə isə onu yüngülləşdirən bir amildir.[145] Bu barədə Allahın elçisi hədislərinin birində buyurmuşdur: *«Dua nazil olan və olmayan bəlalar üçün xeyirlidir. Odur ki, ey Allahın qulları Allaha dua edin!».*[146] O başqa bir hədisində isə belə demişdir: *«Qəzavü-qədəri dəyişdirən ancaq duadır, ömür isə yalnız yaxşılığın sayəsində uzanır».*[147] Lakin burada başa düşülməsi labüd olan bir ünsür vardır. Bu da şəfa istəməkdə və ovsunla müalicədə istifadə olunan ayə, zikr, dua və sığınmalardır ki, bunların da öz-özlüyündə xeyirli bir şəfa vardır. Lakin bunun üçün müalicə aparan şəxsin bu işdə göstərdiyi səylərinin qəbul olması, onun güclü və təsiredici gücə malik

---

***[145] Bax: "əl-Javab əl-Kafi", səh. 22-25.***
***[146] Tirмizi, Haкiм və Əhмəd. Hədisi əl-Albani yaxşı hesab eммişdir. Bax: "Sahih əl-Jaм'i", 3/151,N 3403.***
***[147] Tirмizi, Haкiм və Əhмəd. Hədisi əl-Albani yaxşı hesab eммişdir. Bax: "Silsiləmul-əhadis əs-sahih", 1/76, N154***

olması şəfanın əldə olunması üçün başlıca ünsürlərdir. Şəfa gecikdiyi təqdirdə bilmək lazımdır ki, bunun səbəbi ya müalicə edən şəxsin təsirinin zəifliyi, ya müalicə aparan şəxsin bu işdə göstərdiyi səylərin qəbul olunmaması, ya da dəvanın yaxşı təsir göstərə bilməsinə əngəl törədən güclü bir maneənin olmasıdır. Ovsunla müalicə iki cəhətdən aparılır. Birincisi xəstə tərəfindən, ikincisi isə müalicəni aparan şəxs tərəfindən.

Müalicə xəstənin özü tərəfindən aparıldıqda onun mənəvi cəhətdən güclü olması, Allah-taalaya sidq ürəklə yönəlməsi, Quranın möminlər üçün şəfa və rəhmət olması barədə dəyişməz əqidəyə sahib olması və qəlblə dediklərinin üst-üstə düşdüyü düzgün sığınmalarla Allaha sığınması əsas götürülür və bu da bir müharibə növüdür ki, müharibə aparanın iki amilə sahib olmadan düşmənə qalib gələ bilməsi mümkün deyil.

Bu amillər müharibə aparan şəxsin silahının düzgün və yaxşı, qolunun isə qüvvətli olmasından ibarətdir. Bu iki amildən birinin gecikdiyi təqdirdə, silah lazımi gücü verməkdən aciz olur. Əgər bu iki amilin heç biri olmazsa, onda qəlb Allahın təkliyindən, Ona olan təvəkküldən, Allah qorxusundan və Ona

yönəlməkdən təcrid olaraq xarab olar və buna qarşı da mübarizə aparmaq üçün heç bir silah olmaz.

Müalicə Quran və Sünnədən istifadə edərək müalicə aparan şəxs tərəfindən həyata keçirilsə, yenə də yuxarıda qeyd etdiyimiz iki amilin həmin şəxsdə mövcud olması labüddür.[148] Bu baxımdan da İbn ət-Tin *-Allah ona rəhmət eləsin!-* bu barədə belə demişdir: "Sığınmalar və Allahın adlarından istifadə etməklə aparılan ovsunlu müalicə mənəvi müalicədir və əgər bu müalicəni aparan şəxslər doğru-dürüst insanlardırsa, Allah-taalanın izni ilə xəstə şəfa tapar".[149]

Alimlər üç şərtin mövcud olduğu təqdirdə ovsunlu müalicəyə icazə vermişlər.

1. Ovsunla müalicə Allah-taalanın kəlamı, yaxud Onun ad və sifətləri, yaxud da Onun elçisinin -*səllallahu aleyhi və səlləm-* kəlamı ilə olmalıdır.

2. Ovsunla müalicə ya ərəb dilində, ya da başqaları tərəfindən başa düşülən bir dildə olmalıdır.

3. Etiqad olunmalıdır ki, ovsunla müalicə biləvasitə deyil, Allahın qüdrəti sayəsində təsir göstərir və o, insanın şəfa tapmasında sadəcə olaraq bir vasitə rolunu oynayır.

---

[148] ***Bax: "Zəd əl-Məad", 4/68; "əl-Javab əl-Kafi", səh. 21.***
[149] ***"Fəmh əl-Bari", 10/196.***

Böyük əhəmiyyətə malik bu mövzunu özümün **«Zikr, dua və Quran və Sünnədən istifadə etməklə ovsunla müalicə»** adlı kitabımda müxtəsər şəkildə qələmə aldım və bu fəslə faydalı məsələləri əlavə etdim. Uca və böyük Allahdan Onun gözəl adları və uca sifətləri ilə bu işi sırf Onun rizası üçün etməkdə mənə yardım etməsini diləyirəm. Həmçinin bu işdə mənə, kitabı oxuyanlara, çap etdirənlərə, onun nəşrində vasitəçilik edənlərə və bütün müsəlmanlara xeyir bəxş etməsini diləyirəm. Həqiqətən bunları edən Allah taaladır və O buna qadirdir. Sonda peyğəmbərimiz Məhəmmədə *-səllallahu aleyhi və səlləm-*, onun ailəsinə, əshabələrinə və Qiyamətə qədər onun yolunu layiqincə davam etdirənlərə Allahın salamı, xeyir-duası və bərəkəti olsun deyirəm.

***✍ Allah-taalaya möhtac bəndə***
***Səid bin Əli bin Vəhf əl-Qəhtani***

## 1. CADUNUN AÇILMASI

Cadu olunan insanın ilahi müalicəsi iki mərhələdən ibarətdir.

***Birinci mərhələ.*** Cadunun təsirinin qarşısını almaq üçün nə etməli:

1. Bütün vacibətlərə əməl etməli, bütün haramlardan çəkinməli, o cümlədən pis əməllərdən tövbə etməlidir.

2. Qurani-Kərimin oxunuşunu artırmalı və bu məqsədlə də hər gün onun bir hissəsini (bir cüzünü – otuzda birini) oxumalıdır.

3. Şəriətdəki mövcud dua, sığınma və zikrlərlə müdafiə olunmalıdır. Bu zikrlərdən: səhər-axşam üç dəfə:

**(( بِسْمِ اللهِ الَّذِي لاَ يَضُرُّ مَعَ اسْمِهِ شَيْءٌ فِي الأَرْضِ وَلاَ فِي السَّمَاءِ وَهُوَ السَّمِيعُ الْعَلِيمُ ))**

**«Bismi-l-ləhi-l-ləzi lə yədurru mə‘a ismihi şey‘un fi-l-ardı va lə fi-s-səmə‘i va huva-s-səmi‘u-l-alim»** *(Adı zikr edilərkən yerdə və göydə heç bir şeyin zərər verə bilməyəcəyi Allahın adıyla. O, həqiqətən, hər şeyi eşidən və hər şeyi biləndir)*[150] demək, hər namazın ardınca, yatarkən və səhər-axşam «Kürsi» ayəsinin

---

[150] ***Tirмizi, Əbu Davud, İbn Majə, 2/332.***

qiraəti, səhər-axşam və yatarkən hər biri üç dəfə olmaqla «əl-İxlas», «əl-Fələq» və «ən-Nas» surələrini qiraəti, hər gün yüz dəfə:

**(( لاَ إِلَهَ إِلاَّ اللهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ))**

**«Lə iləhə illə-l-lah vahdəhu lə şərikə ləh, ləhu-l-mulku, va ləhu-l-həmd, va huva alə kulli şey'in qadir»** *(Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur. O təkdir və şəriki yoxdur. Mülk və həmd yalnız Ona məxsusdur və O hər şeyə qadirdir)*[151] zikrinin deyilməsi, səhər-axşam zikirlərinə, namazdan sonrakı zikirlərə, həmçinin yatarkən və yuxudan oyanarkən edilən zikirlərə, evə girdikdə və oradan çıxdıqda edilən zikirlərə, miniyə mindikdə edilən zikrə, məscidə daxil olduqda və oradan çıxdıqda, ayaqyoluna daxil olduqda və oradan çıxdıqda edilən zikirlərə, bəla üz verdikdə və digər hallarda edilən dua və zikirlərə riayət olunmalıdır. Bu zikrlərin əksəriyyətini **«Müsəlmanın qalası»** adlı kitabçamda vəziyyət, məkan və zamana uyğun olaraq qeyd etmişəm. Şübhəsiz ki, bu zikr və dualara riayət olunması Allahın izni ilə cadu və gözdəymənin təsirinə, cinin insan bədəninə daxil

---

[151] ***Buxari, 4/95; Müslim, 4/2071.***

olmasına maneçilik törədən amillərdəndir. Həmçinin bu zikirlər bu və ya digər bəlaların üz verməsindən sonra da onların müalicəsi üçün ən böyük dəvalardandır.

4. İmkan daxilində səhər-səhər acqarına yeddi ədəd xurma yeməlidir. Çünki Peyğəmbər *-səllallahu aleyhi və səlləm-* bu barədə belə demişdir: *«Kim səhər-səhər Mədinənin ən yaxşı xurma növündən yeddi ədəd yesə, həmin gün ona nə zəhər, nə də cadu zərər gətirə bilməz».*[152] Daha yaxşı olardı ki, bu xurma Müslimin rəvayətində də qeyd olunduğu kimi Mədinənin iki dağı arasındakı xurmalarından olsun. Dahi din xadimi Şeyx Əbdüləziz bin Abdullah bin Bazın *-Allah ona rəhmət eləsin-* rəyinə görə Mədinənin bütün xurmalarında Peyğəmbərin *-səllallahu aleyhi və səlləm-* qeyd etdiyi bu əlamət mövcuddur: *«Kim səhər-səhər Mədinənin iki dağı arasındakı acva xurmasından (xurma növü- red.) yeddi ədəd yesə, axşama qədər ona nə zəhər, nə də cadu zərər gətirə bilməz».*[153]

***İkinci mərhələ.*** Cadunun təsirindən sonra onun açılması aşağıdakı mərhələlərə uyğun olaraq həyata keçirilir.

---

[152] ***Buxari, 10/247; Müslim, 3/1618.***
[153] ***Müslim, 3/1618.***

*Birinci növ.* Cadunun qoyulduğu yeri şəriətə görə halal hesab olunan yollarla öyrənildikdən sonra onun oradan çıxarılması və məhv olunması həyata keçirilir. Bu cadu olunan şəxsin müalicə olunması üçün ən yaxşı müalicə üsuludur.

*İkinci növ.* Şəri rüqyə[154]:

**a)** İki daş arasında və ya buna bənzər iki şeylə yaşıl sidr (şanagül) ağacının yeddi yarpağı döyülür, sonra döyülmüş yarpaqların üzərinə qüsl almaq üçün kifayət qədər su əlavə edilir və suya aşağıdakı ayələr (ərəb dilində– red.) oxunur:

أعوذُ باللّهِ مِنَ الشّيطانِ الرّجِيم

*(Rəhmətindən qovulmuş şeytandan Allaha sığınıram).*

**«Allahdan başqa heç bir tanrı yoxdur. [Zatı və kəmal sifətləri ilə hər şeyə qadir olub bütün kainatı yaradan və idarə edən, bəndələrini dolandıran və onların işlərini yoluna qoyan] əbədi və əzəli varlıq Odur. O nə mürgü, nə də yuxu bilər. Göylərdə və yerdə nə varsa, [hamısı] Onundur. Allahın izni olmadan [qiyamətdə] Onun yanında [hüzurunda] kim şəfaət [bu və ya digər şəxsin günahlarının bağışlanmasını xahiş] edə bilər? O, bütün yaranmışların keçmişini və gələcəyini [bütün olmuş və**

---

[154] ***Kimab və Sünnəyə uyğun olaraq ijazə verilmiş ovsun***

olacaq şeyləri] bilir. Onlar [yaranmışlar] Allahın elmindən Onun özünün istədiyindən başqa heç bir şey qavraya bilməzlər. Onun kürsüsü [elmi, qüdrə və səltənəti] göyləri və yeri əhatə etmişdir. Bunları mühafizə etmək Onun üçün heç də çətin deyildir. Ən uca və ən böyük varlıq da Odur!».[155]

«Biz də Musaya: "Əsanı tulla!" – deyə vəhy etdik. Bir də [baxıb gördülər ki] əsa onların uydurub düzəltdikləri bütün şeyləri udur. Artıq haqq zahir, onların uydurub düzəltdikləri yalanlar isə batil oldu. [Sehrbazlar] orada məğlub edildilər və xar olaraq geri döndülər. Onlar [hamı birlikdə] səcdəyə qapanıb: "Biz aləmlərin Rəbbinə, Musanın və Harunun Rəbbinə iman gətirdik!" – dedilər».[156]

«Firon: "Nə qədər bilikli sehrbaz varsa, gətirin!" – dedi. Sehrbazlar gəldikdə Musa: "Nə atacaqsınızsa, atın [istədiyiniz əsaları və kəndirləri yerə atın!]" – dedi. Onlar [əllərindəkini yerə] atdıqda Musa dedi: "Sizin etdiyiniz [gətirdiyiniz] hər şey sehrdir. Allah, sözsüz ki, onu batil edəcəkdir. Allah fitnə-fəsad törədənləri sevməz! Günahkarlar istəməsələr də, Allah sözləri [əmr və

---

[155] *əl-Bəqərə, 255.*
[156] *əl-Əraf, 117-122.*

hökmləri] ilə haqqı gerçəkləşdirəcək [bərqərar edəcəkdir]!”».[157]

«Onlar dedilər: “Ya Musa! [Özün seç]. Ya sən [əvvəlcə əsanı yerə] tulla, ya da biz birinci tullayaq! Musa dedi: “Xeyr, [əvvəlcə] siz tullayın!” [Onlar əllərindəki ipləri və dəyənəkləri yerə atan kimi] Musaya elə gəldi ki, onların sehri nəticəsində kəndirləri hərəkətə gəlib sürünür. Musanın canına qorxu düşdü. [O qorxdu ki, camaat sehrlə möcüzə arasına fərq qoya bilməyib iman gətirməsin]. Biz ona belə buyurduq: “Qorxma, sən mütləq üstün gələcəksən! Sağ əlindəki əsanı yerə tulla, onların düzüb qoşduqlarını [bütün kəndirləri və dəyənəkləri bir anda] udsun. Onların düzəltdikləri sehrbaz hiyləsindən [əfsundan] başqa bir şey deyildir. Sehrbaz isə, harada olursa olsun, mətləbinə çatmaz!” [Musa əsasını yerə atan kimi o bir əcdahaya dönüb sehrbazların iplərini, kəndirlərini və dəyənəklərini yerli-dibli uddu]. Nəhayət, sehrbazlar: “Biz Harunun və Musanın Rəbbinə [Rəbbüləiləminə] iman gətirdik!” – deyib səcdəyə qapandılar».[158]

---

[157] *Yunus, 79-82.*
[158] *Taha, 65-70.*

«[Ya Peyğəmbər! Sənə – bir il sən bizim bütlərimizə ibadət et, bir il də biz sənin Rəbbinə ibadət edək – deyən müşriklərə] de ki: “Ey kafirlər! Mən sizin ibadət etdiyiniz bütlərə ibadət etmərəm! Siz də mənim ibadət etdiyim Allaha ibadət etməzsiniz! Mən sizin ibadət etdiklərinizə ibadət edən deyiləm! Siz də mənim ibadət etdiyimə ibadət edən deyilsiniz. Sizin öz dininiz var, mənim də öz dinim!”».[159]

«[Ya Peyğəmbər! Allahın zatı və sifətləri haqqında səndən soruşan müşriklərə] de ki: “[Mənim Rəbbim olan] O Allah birdir [Heç bir şəriki yoxdur];

Allah [heç kəsə heç nəyə] möhtac deyildir! [Hamı Ona möhtacdır; O əzəli və əbədidir!]

O, nə doğmuş, nə də doğulmuşdur! [Allah özünə heç bir övlad götürməmişdir!]

Onun heç bir tayı-bərabəri bənzəri də yoxdur!”».[160]

«[Ya Peyğəmbər!] De ki: “Pənah aparıram sübhün Rəbbinə!

Yaratdıqlarının [insanların, cinlərin, vəhşi heyvanların] şərindən;”

---

[159] *əl-Kafirun, 1-6.*
[160] *əl-İxlas, 1-4.*

**Zülmətə bürünməkdə olan gecənin [və ya batan ayın, ziyası sönən ulduzların] şərindən;**

**[Ovsun oxuyub] düyünlərə üfürən [yaxud cadu edib iplərə düyün vuran] qadınların şərindən;**

**Və bir də paxılın şərindən!"».**[161]

**«[Ya Peyğəmbər!] De ki: "Pənah aparıram insanların Rəbbinə;**

**İnsanların ixtiyar sahibinə;**

**İnsanların tanrısına;**

**Vəsvəsə verən, [Allahın adı çəkiləndə isə qorxusundan] qaçıb gizlənən Şeytanın şərindən –**

**O Şeytan ki, insanların ürəklərinə vəsvəsə salır,**

**[O Şeytan ki] cinlərdən də olur, insanlardan da!"».**[162]

Ayələrin suya oxunuşundan sonra üç dəfə bu sudan içilir, qalanı ilə isə qüsl alınır. Bununla da inşaallah dərd aradan qalxır. Əgər bu prosesin iki dəfə və ya daha çox təkrarına ehtiyac duyulsa, xəstəlik sağalana kimi bunu etməkdə heç bir qəbahət yoxdur. Artıq bu üsul dəfələrlə təcrübədən keçmiş və Allah-taala bununla fayda vermişdir. Xüsusilə bu üsul qadını ilə yaxınlıq edə bilməyən kişilərin müalicəsi üçün daha məqsədəuyğundur.

---

[161] *əl-Fələq, 1-5.*
[162] *ən-Nas, 1-6.*

**b)** «əl-Fatihə» surəsi, «Kürsi» və «əl-Bəqərə» surəsinin son iki ayəsi, «əl-İxlas», «əl-Fələq» və «ən-Nas» surələrinin hər biri dil ucu yüngülcə tüpürmək və sağ əli ağrının üzərinə çəkməklə üç dəfə və ya daha çox oxunmalıdır.

**v)** _Sığınmalar, rüqyə və bütün dualar:_

1. Yeddi dəfə:

1- (( أَسْأَلُ اللهَ الْعَظِيمَ رَبَّ الْعَرْشِ الْعَظِيمِ أَنْ يَشْفِيَكَ ))

**«Əs‘əlu-l-lahə-l-azım rabbə-l-arşi-l-azım ən yəşfiyəkə»** (*Əzəmətli ərşin Rəbbi, əzəmətli Allahdan sənə şəfa diləyirəm!*).[163]

2. Xəstə əlini ağrısı olan əzanın üstünə qoyub üç dəfə: **(( بِسْمِ اللهِ )) «Bismil-ləh»** (*Allahın adı ilə*), yeddi dəfə isə:

2- (( أَعُوذُ بِاللهِ وَقُدرَتِهِ مِنْ شَرِّ مَا أَجِدُ وأُحَاذِرُ ))

**«Ə‘uzu bil-ləhi va qudratihi min şərri mə əcidu va uhaziru»** (*Hiss etdiyim və qorxduğum [ehtiyat etdiyim] ağrının şərindən Allaha və Onun qüdrətinə pənah aparıram*)[164] – zikrini oxumalıdır.

---

[163] ***Tirmizi, 2/410, Əbu Davud, 3/187.***
[164] ***Müslim, 4/1728.***

3- (( اللَّهُمَّ رَبَّ النَّس أذْهِبِ الْبأْسَ وَاشْفِ أنْتَ الشَّافِى لاَ شِفَاءَ إلاَّ شِفَاؤُكَ شِفاءً لا يُغَادِرُ سَقَماً ))

**3- «Allahummə rabbən-nəsi əzhibil-bə'sə vaşfi əntəş-şəfi lə şifəə illə şifəukə şifəən lə yuğədiru səqamən»** (*Ey Allahım, ey insanların Rəbbi! İztirabı apar, şəfa ver! Sənsən şəfa verən! Sənin bəxş etdiyin şəfadan başqa şəfa yoxdur və o elə bir şəfadır ki, heç bir xəstəliyi yaxına buraxmaz!).*[165]

4- (( أعُوذُ بِكَلِمَاتِ اللهِ التَّمَّاتِ مِنْ كُلِّ شَيْطَانٍ وَهَامَّةٍ وَ مِنْ كُلِّ عَيْنٍ لاَمَّةٍ ))

**4- «Ə'uzu bikəlimətil-ləhi ət-təmməti min kulli şeytanin va həmmətin va min kulli aynin ləmməh»** (*Hər bir şeytan və həşəratdan və hər bəd nəzərdən Allahın mükəmməl və nöqsansız kəlimələrinə sığınıram*).[166]

5- (( أعُوذُ بِكَلِمَاتِ اللهِ التَّمَّاتِ مِنْ شَرِّ مَا خَلَقَ ))

**5- «Ə'uzu bikəlimətil-ləhi ət-təmməti min şərri mə xaləq»** (*Yaratdıqlarının şərindən Allahın mükəmməl və nöqsansız kəlimələrinə sığınıram*).[167]

---

***165 Buxari, 10/206, Müslim, 4/1721.***
***166 Buxari, 6/408.***
***167 Müslim, 4/1728.***

6- (( أَعُوذُ بِكَلِمَاتِ اللهِ التَّمَّاتِ مِنْ غَضَبِهِ وَ عِقَابِهِ وَ شَرِّ عِبَادِهِ وَ مِنْ هَمَزَاتِ الشَّيَاطِينِ وَ أَنْ يَحْضُرُونْ ))

**6- «Ə'uzu bikəlimətil-ləhi ət-təmməti min ğadabihi va iqabihi va şərri ibədihi va min həməzətiş-şəyatini va ən yəhdurun»** (*Allahın qəzəbindən, cəzasından, bəndələrinin şərindən, şeytanın vəsvəsələrindən və onların məni pisliyə bulaşdırmasından Allahın mükəmməl və nöqsansız kəlimələrinə sığınıram).*[168]

7- (( أَعُوذُ بِكَلِمَاتِ اللهِ التَّمَّاتِ الَّتِي لاَ يُجَاوِزُهُنَّ بَرٌّ وَ لاَ فَاجِرٌ مِنْ شَرِّ مَا خَلَقَ, وَ بَرَأَ وَ ذَرَأَ, وَ مِنْ شَرِّ مَا يَنْزِلُ مِنْ السَّمَاءِ, وَ مِنْ شَرِّ مَا يَعْرُجُ فِيهَا, وَ مِنْ شَرِّ مَا ذَرَأَ فِي الأَرْضِ, وَ مِنْ شَرِّ مَا يَخْرُجُ مِنْهَا, وَ مِنْ شَرِّ فِتَنِ اللَّيْلِ وَ النَّهَارِ, وَ مِنْ شَرِّ كُلِّ طَارِقٍ الأَ طَارِقاً يَطْرُقُ بِخَيْرٍ يَا رَحْمَنُ ))

**7- «Ə'uzu bikəlimətil-ləhi ət-təmməti əlləti lə yucəvizuhunnu bərrun va lə fəcirun min şərri mə mə xaləqə, va bərə-ə va zərə-ə, va min şərri mə yənzilu minəs-səməi, min şərri mə yə'rucu fihə, va min şərri mə zərə-ə fil-ardı, va min şərri mə yəxrucu minhə, və min şərri fitənil-leyli van-nəhəri, va min şərri kulli tariqin illə tariqən yətruqu bixeyrin yə rahmən»** (*Ey rəhmli olan Allah! Allahın yaratdıqlarının, yoxdan var edib yaratdıqlarının, göydən nazil olanların və göyə*

---

*[168] Əbu Davud, Tirмizi, 3/171.*

*ucalanların, yerə əkdiklərinin və yerdən çıxanların, gecənin və gündüzün fitnələrinin, xeyirlə qapını döyənlərdən başqa bütün qapı döyənlərin şərindən yaxşı və pisin kənarına çıxa bilməyəcəyi Allahın mükəmməl və nöqsansız kəlimələrinə sığınıram*).[169]

**8- (( اللَّهُمَّ رَبَّ السَّمَوَاتِ السَّبْعِ وَرَبَّ الْعَرْشِ الْعَظِيمِ، رَبَّنَا وَرَبَّ كُلِّ شَيْءٍ، فَالِقَ الْحَبِّ وَالنَّوَى، وَمُنْزِلَ التَّوْرَاةِ وَالْإِنْجِيلِ وَالْفُرْقَانِ: أَعُوذُ بِكَ مِنْ شَرِّ كُلِّ شَيْءٍ أَنْتَ آخِذٌ بِنَاصِيَتِهِ. اللَّهُمَّ أَنْتَ الْأَوَّلُ فَلَيْسَ قَبْلَكَ شَيْءٌ، وَأَنْتَ الْآخِرُ فَلَيْسَ بَعْدَكَ شَيْءٌ، وَأَنْتَ الظَّاهِرُ فَلَيْسَ فَوْقَكَ شَيْءٌ، وَأَنْتَ الْبَاطِنُ فَلَيْسَ دُونَكَ شَيْءٌ، اقْضِ عَنَّا الدَّيْنَ وَأَغْنِنَا مِنَ الْفَقْرِ ))**

**8- «Allahummə rabbə-s-səməvati-s-səb‘i va rabbə-l-arşi-l-azım, rabbənə və rabbə kulli şey‘in, fəliqa-l-habbi va-n-nəva, va munzilə-t-taurati va-l-incil, va-l-furqan: ə‘uzu bikə min şərri kulli şey‘in əntə əxizun binəsıyətihi. Allahummə əntə-l-avvalu fəleysə qabləkə şey‘un va əntə-l-əxiru fəleysə bə‘dəkə şey‘un, va əntə zahiru fəleysə fauqəkə şey‘un, va əntə-l-batınu fəleysə dunəkə şey‘un aqdı annə-d-deynə və əğninə minə-l-faqrı»** (*Yeddi qat göyün, əzəmətli ərşin Rəbbi olan Allahım! Bizim və hər şeyin Rəbbi olan, dənəni və toxumu yaran, Tövratı, İncili və Quranı nazil edən Rəbbimiz! Kəklindən*

---

***[169] Əhməd, "Müsnəd", 3/119, səhih isnadla; "Məjmə əz-Zəvaid", 10/127.***

*tutduğun (alnıma yazılan- red.) hər şeyin (Hər şey Sənin mülkiyyətindədir və onu istədiyin kimi istifadə edirsən) şərindən Sənə pənah aparıram. Əvvəl də Sənsən, Səndən qabaq heç bir şey yoxdur. Axır da Sənsən, Səndən sonra heç bir şey yoxdur. Zahir də Sənsən, Səndən yuxarıda heç bir şey yoxdur. Batin də Sənsən, Sənsiz heç nə yoxdur. Bizi borclu olmaqdan xilas et və kasıbçılıqdan çıxarıb zənginləşdir!*)[170]

**9- (( بسْمِ اللهِ أَرْقِيكَ مِنْ كُلِّ شَيْءٍ يُؤْذِ يكَ وَ مِنْ شَرِّ كُلِّ نَفْسٍ أوْ عَيْنِ حَاسِدٍ اللّهُ يَشْفِيكَ بِسْمِ اللهِ أَرْقِيكَ ))**

**9- «Bismil-ləhi ərqikə min kulli şeyin yu'zikə va min şərri kulli nəfsin av aynin hasidin. Allahu yəşfikə. Bismil-ləhi ərqikə»** (*Sənə zərəri toxuna biləcək hər bir şeydən, hər bir nəfsin şərindən və paxılın bəd nəzərindən, Allahın adı ilə səni rüqyə edirəm. Allah sənə şəfa versin! Allahın adı ilə səni rüqyə edirəm*).[171]

**10- ((بِسْمِ اللهِ يُبْرِكَ وَ مِنْ كُلِّ دَاءٍ يَشْفِيكَ وَ مِنْ شَرِّ حَا سِدٍ إِ ذَا حَسَدَ وَ مِنْ شَرِّ كُلِّ ذِي عَيْنٍ ))**

**10- «Bismil-ləhi yubrikə va min kulli dəin yəşfikə va min şərri hasidin izə hasədə va min şərri kulli zi-aynin»**

---

***170 Müslim, 4/2084.***
***171 Hədisi Əbu Səid əl-Xudridən Müslim rəvayəm emmişdir, 4/1718.***

(*Allahın adı ilə! Allah sənə şəfa versin. Hər bir bəladan, həsəd aparanın və bəd nəzəri olan hər bir kəsin şərindən sənə şəfa versin*).[172]

11- (( بِسْمِ اللهِ أَرْقِيكَ مِنْ كُلِّ شَيْءٍ يُؤْذِ يكَ مِنْ حَسَدِ حَاسِدٍ وَ مِنْ كُلِّ ذِي عَيْنٍ اللَّهُ يَشْفِكَ ))

**11- «Bismil-ləhi ərqikə min kulli şeyin yu'zikə min hasidin va min kulli zi-aynin. Allahu yəşfik»** (*Sənə zərəri toxuna biləcək hər bir şeydən, paxılın həsədindən və bəd nəzəri olan hər kəsdən Allahın adı ilə səni rüqyə edirəm. Allah sənə şəfa versin!*).[173]

Bu sığınmalar, dua və zikrlər vasitəsilə cadu, gözdəymə, cinin toxunması və bütün xəstəliklər müalicə olunur. Həqiqətən bu Allahın izni ilə bütöv və xeyirli bir müalicə üsuludur [rüqyədir].

*Üçüncü növ.* Əgər mümkündürsə, cadunun əlamətinin üzə çıxdığı əzadan, yaxud yerdən qan alınmalıdır. Əks halda isə Allaha şükürlər olsun ki, yuxarıda qeyd olunan dualarla müalicə etmək kifayətdir.

*Dördüncü növ.* Təbii dərmanlar. Qurani-Kərim və pak Sünnənin göstərdiyi elə təbii xeyirli dərmanlar vardır ki, əgər insan yəqinlik, sidq ürək və xeyrin

[172] *Hədisi Aişədən Müslім rəvayəm emмişdir, 4/1718.*
[173] *İbn Majə, 2/268.*

Allahdan olmasına etiqad edərək bunlardan istifadə etsə, inşaallah Allah onun bu işini xeyirlə nəticələndirər. Həmçinin təbii dərmanlarla yanaşı otlardan və bu kimi müxtəlif bitkilərdən hazırlanmış qarışıq dəvalar da vardır ki, bunların müalicədə istifadə olunması təcrübəyə əsaslanır. Əgər bu dəvalar haram buyurulmayıbsa, şəri cəhətdən onların istifadə olunmasında heç bir qəbahət yoxdur. Təbii xeyirli dərmanlara aşağıdakıları misal göstərmək olar: bal, qaraçörəkotu (qara zirə), Zəm-zəm suyu, Allah-taalanın buyurduğu kimi:

**«Biz göydən bərəkətli su endirdik...»**[174] - yağış və zeytun yağı. Çünki zeytun barədə Peyğəmbər - *səllallahu aleyhi və səlləm-* buyurmuşdur: *«Onu yeyin və yağını bədəninizə sürtün, çünki o, mübarək bir ağacdandır».*[175] Təcrübədən, istifadəsindən və elmi-nöqteyi nəzərdən belə məlum olur ki, zeytun yağı ən əfzəl yağdır. Yuyunmaq, təmizlənmək və ətirlənmək də təbii müalicəvi əhəmiyyətə malikdir.

## 2. GÖZDƏYMƏDƏN MÜALİCƏ

---

[174] ***Qaf, 9.***
[175] ***Əhməd, 3/497, Tirmizi, 2/166, İbn Majə. Hədisi əl-Albani səhih hesab emmişdir.***

Gözdəymədən müalicə üç mərhələdən ibarətdir.

***Birinci mərhələ.*** Gözə gəlməmişdən əvvəl nə etməli?

1. «Cadunun açılması» fəslinin birinci mərhələsində qeyd olunan şəriətdəki mövcud zikr, dua və sığınmalarla qorunmaq və bu üsulla da bəd nəzərə məruz qalması ehtimal olunan şəxsin qorunması labüddür.

2. Özünün bir şeyi gözə gətirməsindən qorxan bəndə özündə, mal-dövlətində, övladında, qardaşında, yaxud da digərlərdə ona xoş təsir bağışlayan bir şey görsə, onun bərəkətli olması üçün xeyir-dua etsin və:

**(( مَا شَاءَ اللَّهُ لاَ قُوَّةَ إِلاَّ بِاللَّهِ اللَّهُمَّ بَارِك عَلَيْهِ ))**

**«Mə şə allahu lə quvvatə illə billəh. Allahummə bərik aleyh»** (*Maşallah, Allahdan başqa qüvvət sahibi yoxdur, Allahım onu bərəkətli et!*) – desin. Çünki bu barədə Peyğəmbər *-səllallahu aleyhi və səlləm-* buyurmuşdur: *«Kim qardaşında ona xoş təsir bağışlayan bir şey görsə, onun bərəkətli olması üçün xeyir-dua etsin!»*[176]

3. Gözə gəlməsindən ehtiyat edən şəxs məziyyətlərini gizlətməlidir.

***İkinci mərhələ.*** Gözə gəldikdən sonra nə etməli?

---

[176] ***Malik, 2/938, İbn Majə, 2/1160, Əhməd, 4/447.***

1. Gözü dəyən şəxsin kimliyi məlum olduqdan sonra ona dəstamaz aldırılır, sonra bu sudan gözəgələn şəxs qüsl almalıdır.[177]

2. «əl-İxlas», «əl-Fələq», «ən-Nas» və «əl-Fatihə» surələrinin, «Kürsi» və «əl-Bəqərə» surəsinin son üç ayəsinin qiraəti, «Cadunun açılması» fəslinin ikinci mərhələsinin «V» bəndində də göstərildiyi kimi rüqyə barədə şəriətdəki mövcud duaların dil ucu tüpürmək və sağ əli ağrının üzərinə çəkməklə daha çox oxunmalıdır.

3. Suya oxuyaraq dil ucu tüpürməli, sonra xəstə bu sudan içməli və qalanını isə onun üzərinə tökməlidirlər.[178] Yaxud zeytun yağına oxunmalı və o bədənə sürtülməlidir.[179] Əgər oxunulan su Zəm-zəm və ya yağış suyu olsa, onda müalicə daha mükəmməl şəkildə həyata keçirilmiş olar.

4. Qurandan müxtəlif ayələrin, o cümlədən «əl-İxlas», «əl-Fələq», «ən-Nas» və «əl-Fatihə» surələrini, «Kürsi» və «əl-Bəqərə» surəsinin son iki ayəsini, «Cadunun açılması» fəslinin ikinci mərhələsinin «b» və «v» bəndlərində də göstərildiyi kimi rüqyə barədə

---

[177] *Əbu Davud, 4/9.*
[178] *Allahın elçisi də Sabim ibn Qeysi bu jür мüalijə emмişdir.*
[179] *Əhмəd, 3/497.*

mövcud duaları yazıb suda yuduqdan sonra onun xəstəyə içirdilməsində heç bir qəbahət yoxdur.

***Üçüncü mərhələ.*** Paxılın bəd nəzərinin qarşısının alınmasına səbəb olan əməllərin yerinə yetirilməsi üçün nə etməli?

1. Onun şərindən Allaha pənah aparmalı.

2. Hər cür qüsurlardan uzaq və uca olan Allahdan qorxmalı və Onun əmr və qadağalarına riayət etməlidir. Çünki Peyğəmbərimiz *-səllallahu aleyhi və səlləm-* bunu hədislərinin birində belə vurğulamışdır: *«...Allahı qoru ki, O da səni qorusun...».*[180]

3. Paxılın əməllərinə səbr və dözüm göstərməli, onu bağışlamağı bacarmalı, onunla dalaşmamalı, ondan şikayətlənməməli və onun törətdiyi zərərləri barədə deyinməməlidir.

4. Allaha təvəkkül etməlidir. Kim Allaha təvəkkül etsə, Allah ona bəs edər.

5. Paxıldan qorxmamalı və ürəyini onun barəsində olan fikirlərlə doldurmamalıdır. Çünki bu ən xeyirli müalicə üsullardandır.

6. Hər cür qüsurlardan uzaq və uca olan Allahın hüzuruna qayıtmalı, ibadətini sırf Onun üçün etməli və Onun razılığını istəməlidir.

---

[180] ***Tirмizi, 2/309.***

7. Günahlarından tövbə etməlidir, çünki günahlar düşmənlərin insanın üstünə qalxması ilə nəticələnir. Bu barədə Allah-taala buyurur: **«Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların [etdiyiniz əməllərin] ucbatındandır!»**[181]

8. İmkan daxilində sədəqə verməli və yaxşılıqlar etməlidir. Çünki belə əməllər bəlanın üz verməməsində, gözdəymənin təsirinin yox olmasında və paxılın şərinin qarşısının alınmasında möcüzəvi təsirə malikdir.

9. Paxılın, haqsızlıq edənin, əziyyət verənin alovunu yaxşılıqla söndürməli, hər dəfə sənə verdiyi əziyyətin, gətirdiyi şərin, etdiyi haqsızlıq və paxıllığın müqabilində ona yaxşılıq etməli, nəsihət verməli, ona qarşı şəfqət və mərhəmət göstərməlisən. Qeyd etmək lazımdır ki, Allah tərəfindən böyük payla mükafatlandırılan insanlardan başqa hər kəsdə bu cür alicənab bir keyfiyyəti müşahidə etmək olmur.

10. Allahın təkliyini digər şeylərdən təcrid etməklə tam şəkildə qəbul etməli və onu yalnız izni olmadan hər hansı bir şeyin nə zərər, nə də xeyir gətirə biləcəyi imkansız olan yenilməz qüvvət və hikmət sahibi Allaha aid etməlidir. Çünki tövhid bütün bu sifətləri özündə

---

[181] *əş-Şura, 30.*

əks etdirir və bu səbəblər bütünlüklə tövhid kəlməsi adı altında vəhdət təşkil edir. Onu da qeyd etmək lazımdır ki, tövhid Allahın ən əzəmətli qalasıdır və kim bu qalaya daxil olsa, dinc və əmin-amanlıq içində olanlardan olar.

Bu on əməllə paxılın, bəd nəzəri olan adamın və cadukarın şəri dəf olunur.

## 3. BƏDƏNİNƏ CİN DAXİL OLMUŞ İNSANIN MÜALİCƏSİ

Cinin bədənə daxil olaraq onun şüuruna təsir edən epileptik[182] insanın müalicəsi iki mərhələdə həyata keçirilir.

***Birinci mərhələ.*** Xəstəliyin qabağını almaq üçün hansı tədbirlər görülməlidir?

Bütün fərz və vacibatlara riayət olunmalı, bütün haramlardan çəkinməli və bütün pis əməllərdən tövbə edilməlidir. Bununla yanaşı şəriətdə doğru hesab olunan zikr, dua və sığınmalarla qorunmalıdır.

***İkinci mərhələ.*** Cinin insan bədəninə daxil olmasından sonra hansı müalicəvi tədbirlərin görülməsi məqsədəuyğundur?

---

[182] ***Epilepsiya (Özündən gemмə xəsməliyinin bir növü) xəsməliyi olan adaм***

Oxuduğundan qəlbi də təsirlənən və rüqyəsi epileptik üçün uyğun olan müsəlmanın Quran oxuması bu tədbirlərdən hesab olunur. Ən böyük müalicə tədbiri isə «əl-Fatihə» surəsi, «Kürsi» ayəsi, «əl-Bəqərə» surəsinin son iki ayəsi, «əl-İxlas», «əl-Fələq» və «ən-Nas» surələri epileptikin üzərinə dil ucu tüpürməklə oxunmalı, üç və ya daha çox təkrar olunmalıdır. Yaxud bu üsulla digər quran ayələri oxunmalıdır, çünki qəlblərdə olan xəstəliklər üçün Quran bütünlüklə şəfadır. O həm də möminlər üçün bir şəfa, doğru yol və rəhmətdir. Həmçinin «Cadunun açılması» fəslinin ikinci mərhələsinin «b» və «v» bəndlərində də göstərildiyi kimi ovsunla müalicə barədə mövcud duaların oxunması bu müalicə tədbirlərindəndir. Ümumiyyətlə müalicə tədbirləri həyata keçirilərkən burada iki əsas amilin öz əksini tapması labüddür. Birincisi ondan ibarətdir ki, epileptik öz nəfsinə hakim olmağı bacarmalı, sidq ürəklə Allaha yönəlməli və dillə ifadə edərkən qəlbən də təsirləndiyi düzgün sığınmalarla Allaha pənah aparmalıdır. İkincisi isə, xəstəni müalicə edən şəxsin özündə də bu keyfiyyətlər mövcud olmalıdır. Çünki silah ondadır.

Digər müalicə tədbirlərindən biri də epileptikin qulağına azanın oxunulmasıdır. Çünki şeytan bu səsdən baş götürüb qaçır.[183]

## 4. MƏNƏVİ XƏSTƏLİKLƏRİN MÜALİCƏSİ

Mənəvi xəstəliklərin və ürək sıxıntısının ən böyük müalicə üsulları aşağıda müxtəsər şəkildə qeyd olunmuşdur.

1. Zəlalət və Allaha şərik qoşmaq ürək sıxıntısının ən başlıca səbəblərindən olduğu kimi doğru yol və tövhid də bu sıxıntının müalicəsidir.

2. Saleh əməllə birgə Allahın qulun ürəyinə atdığı həqiqi iman nuru belə xəstəliklərin dəvasıdır.

3. Belə dəvalardan biri də faydalı elmdir. Belə ki, hər dəfə qulun elmi artdıqca, onun qəlbi açılır və genişlənir.

4. Hər cür qüsurlardan uzaq və uca olan Allaha tövbə etməli, Onun yoluna dönməli, tam ürəklə Onu sevməli, Onun hüzuruna qayıtmalı və Ona ibadət etməkdən zövq almalıdır.

5. Hər bir vəziyyətdə və hər bir yerdə Allahı mütəmadi qaydada zikr etməlidir. Qeyd etmək

---

[183] ***Buxari, 574.***

lazımdır ki, Allahı yada salmağın köksün açılmasında, ürəyin rahatlıq tapmasında, hüzn və kədərin unudulmasında möcüzəvi təsiri vardır.

6. İmkan daxilində insanlara müxtəlif növ yaxşılıqlarla yaxşılıq etmək, onlara xeyir vermək müalicənin üsullarındandır. Çünki yaxşılıq edən səxavətli adam insanlar arasında ən ürəyi açıq, ən xoş xasiyyət və qəlbi sağlam olandır.

7. Müalicənin üsullarından biri də şücaətli və mərd olmaqdır, çünki şücaət və mərdlik köksün açılmasına və qəlbin genişlənməsinə gətirib çıxarır.

8. Ürəyin sıxıntısı və əzab çəkməsilə nəticələnən həsəd, nifrət, kin, ədavət, haqsızlıq kimi pis ləkələrin oradan xaric edilməsi xəstəliyin müalicə üsullarındandır. Peyğəmbərdən *–səllallahu aleyhi və səlləm–* insanların ən fəzilətlisi barədə soruşduqda, o belə cavab vermişdir: *«Ürəyi bütünlüklə təmiz (süpürülmüş), dili isə tam doğru olandır».* Əshabələr soruşublar: «Dili doğru olanı bilirik. Bəs ürəyi təmiz (süpürülmüş) nə deməkdir?» Belə cavab vermişdir: *«O təqvalı və ləkəsiz olandır. Orada nə günah, nə haqsızlıq, nə kin-küdurət, nə də həsəd vardır».*[184]

[184] ***İbn Majə, 2/411.***

9. Bu xəstəlikdən müalicə olunan adam çox baxmaq, çox danışmaq, çox dinləmək, çox ünsiyyətdə olmaq, çox yemək və çox yatmaq kimi vərdişlərdən əl çəkməlidir, çünki belə vərdişlərin tərk edilməsi köksün açılmasına, ürəyin rahatlıq tapmasına, hüzn və kədərin unudulmasına səbəb olur.

10. Faydalı iş və ya faydalı elmlə məşğul olmalıdır. Çünki belə məşğuliyyətlər ürəyi ona əziyyət verən amillərdən uzaqlaşdırır.

11. Hazırkı günün işi ilə maraqlanmalı, gələcəkdə olacaqlara maraq göstərməməli, keçmişdə olanlara üzülməməlidir. Bəndə dinində və dünyasında ona xeyir gətirən işlər görməli, məqsədinə nail olmaq üçün Rəbbindən kömək diləməlidir. Çünki bütün bunlar insan üçün hüzn və kədərdən bir təsəllidir.

12. Özündən aşağı səviyyədə yaşayan insanlara baxmalı, salamatlıq, ruzi və bu qəbildən olan digər nemətlərdə səndən yaxşı səviyyədə yaşayan insanlara baxmamalısan.

13. Geri qaytarılması mümkün olmayan keçmişdə qalmış xoşagəlməz hadisələri unutmalı və bu hadisələr barədə qətiyyən fikirləşməməlidir.

14. Əgər qulun başına bəla gəlsə, o bu bəlanı yüngülləşdirməyə çalışmalıdır. Bunun üçün müsibətin

ən pis ehtimalını götürüb, ondan gücü çatdığı qədər müdafiə olunmağa çalışmalıdır.

15. Ürək güclü olmalı, pis fikirlərin cəlb etdiyi xəyal və illüzyalarla ona əziyyət verməməli, qəzəblənməməli, xoşa gələn hadisələrin yox olmasını, xoşagəlməz hadisələrin isə baş verməsini gözləməməlidir. Əksinə faydalı səbəblər göstərmək və Allahdan bağışlanma və sağlamlıq diləyərək hadisələrin gedişatını və ya gələcək işləri uca və böyük Allahın öhdəsinə və ümidinə buraxmalıdır.

16. Ürəyi Allaha bağlamaq, Ona təvəkkül etmək və gözəl zənlərlə hər cür qüsurlardan uzaq və uca olan Allaha ümid bəsləmək. Həqiqətən Allaha təvəkkül edənlərə heç bir illüzya və xəyal təsir edə bilməz.

17. Ağıllı insan bilir ki, onun düzgün həyatı səadət və əmin-amanlıq həyatıdır və bu həyat çox qısadır. Belə insan çox qısa olan bu həyatını qayğı və kədərlərə qapınmaqla daha da qısaltmaz. Çünki belə həyat tərzi keçirmək doğru, düzgün bir həyat tərzinin tam əksidir.

18. Əgər ağıllı insanın başına xoşagəlməz bir hadisə gəldikdə, o, bu hadisəni ona nəsib olmuş dini və dünyəvi nemətlərlə müqayisə edər və nəticədə içində olduğu nemətlərin üstünlük təşkil etdiyi ortaya çıxar. Həmçinin ona zərər gətirməsindən qorxduğu ehtimallarla salamatlıq barədə olan ehtimalları

müqayisə edər və zəif ehtimalın çoxlu və güclü ehtimallara üstün gələcəyinə imkan verməz. Bununla da onun qəm-qüssəsi və qorxusu aradan qalxar.

19. Aqil insan bilir ki, insanların onu barədə xoşagəlməz sözlər danışması ona heç bir zərər gətirməz, əksinə zərər görənlər həmin insanların özləridir. O bu təhqirlərin ona zərər verməməsi üçün bu barədə fikirləşməməli və vaxtını belə şeylər ətrafında düşünməklə keçirməməlidir.

20. O, fikrini dinində və dünyasında ona faydası toxunacaq işlərə yönəltməlidir.

21. Bəndə etdiyi yaxşılığa görə Allahdan başqa heç kəsdən təşəkkür ummamalı və bilməlidir ki, onun davranış və münasibəti yalnız Allah rizası naminədir və yaxşılıq etdiyi insanın təşəkkür etməsi onun üçün bir o qədər də əhəmiyyət daşımır. Bu barədə Allah Qurani-Kərimdə buyurur: **«[Və sonra da yedirtdikləri kimsələrə belə deyərlər]: «Biz sizi ancaq Allah rizasından ötrü yedirdirik. Biz sizdən [bu ehsan müqabilində] nə bir mükafat, nə də bir təşəkkür istəyirik».**[185] Bəndə öz ailəsi və övladları ilə münasibətdə də bu prinsipdən möhkəm yapışmalıdır.

---

[185] *əl-İnsan, 9.*

22. Faydalı işləri qarşısına məqsəd qoymalı, onları həyata keçirmək üçün müvafiq tədbirlər görməli, zərər gətirən işlərə diqqətini cəlb etməməli və fikrini bu istiqamətə yönəltməməlidir.

23. Hal-hazırda mövcud olan işləri yoluna qoymalı, gələcəkdə görüləcək işləri tərk etməlidir ki, onlar barədə yaxşıca fikirləşə bilsin və onları düzgün şəkildə həll etməyə nail ola bilsin.

24. Xeyirli işlərdən, faydalı elmlər olan dini və dünyəvi elmlərdən, xüsusilə də daha çox həvəs göstərdiyi şeylərdən bəhrələnməli, bu barədə Allahdan kömək istəməli və insanlardan məsləhət almalıdır. Əgər xeyir həyata keçsə və bu işi görəcəyi barədə qərar qəbul etmiş olsa, Allaha təvəkkül edər.

25. Allahın görünən və görünməyən nemətləri haqda söhbət edilməlidir. Həqiqətən, bu nemətləri tanımaq və bunlar barədə söhbət etmək Allahın qəm-qüssə və kədərləri dəf etməsinə və qulun Ona şükr etməsinə gətirib çıxarır.

26. İnsan zövcəsi, qohum-əqrabası və aralarında hər hansı bir əlaqə olan şəxslə yaxşı münasibət qurmalı, onda olan yaxşı cəhətləri bilməklə onda hər hansı bir eyib görsə, bunları müqayisə etməlidir. Belə olan halda yaxşı münasibət və dostluq davam edər və qəlb açılar. Bu barədə Allahın elçisi buyurmuşdur:

*«Mömin kişinin mömin qadından zəhləsi getməməlidir! Bir cəhətindən narazı qalsa da, digərindən mütləq razı qalacaqdır».*[186]

27. Bütün işlərin öz yoluna qoyulması üçün Allaha dualar edilməlidir. Belə duaların ən məşhurları və ən təsirliləri aşağıdakılardır:

**((اللَّهُمَّ أَصْلِحْ لِى دِينِى الَّذِى هُوَ عِصْمَةُ أَمْرِى, وَ دُنْيَايَ الَّتِى فِيهَا مَعَاشِى, وَاخِرَتِى الَّتِى إِلَيهَا مَعَادِى, وَاجْعَلِ الْحَيَاةَ زِيَادَةً لِى فِى كُلِّ خَيْرٍ, وَالْمَوْتَ رَاحَةً لِى مِنْ كُلِّ شَرٍّ ))**

**«Allahummə əslih li dini-l-ləzi huva 'ismətu əmri, va dunyəyə əlləti fihə məəşi va axirəti əlləti ileyhə məədi, vacəli-l-həyətə ziyədətən li fi kulli xəyran, val-mavtə rahatən li min kulli şərrən»** (*Allahım! Xoşbəxtliyimin zəmanəti olan dinimi təkmilləşdir, yaşayışımın əsası olan dünyamı sahmana sal, qayıdış yerim olan axirətimi yaxşılaşdır. Həyatı mənim üçün hər bir xeyir işdə artım və ölümü mənim üçün hər bir şər işdən qurtuluş et!*).[187] Başqa bir duada isə belə deyilir:

**(( اللَّهُمَّ رَحْمَتَكَ أَرْجُو، فَلاَ تَكِلْنِي إِلىَ نَفْسِي طَرْفَةَ عَيْنٍ، وَأَصْلِحْ لِي شَأْنِي كُلَّهُ، لاَ إِلَهَ إِلاَّ أَنْتَ ))**

---

[186] ***Müslim, 2/1091.***
[187] ***Müslim, 4/2087***

**«Allahummə rahmətəkə ərcu fələ təkilni ilə nəfsi tarfətə ayn va aslıh li şə'ni kulləhu, lə iləhə illə ənt»** (*Allahım! Sənin mərhəmətini diləyirəm. Bir göz qırpımına belə məni öz ixtiyarıma buraxma və bütün işlərimi sahmana sal. Səndən başqa ibadətə layiq haqq məbud yoxdur*).[188]

28. Allah yolunda cihada qalxmaq da belə müalicə üsullarındandır. Bu haqda Peyğəmbər *-səllallahu aleyhi və səlləm-* hədislərinin birində belə buyurmuşdur: *«Allah yolunda cihada qalxın. Həqiqətən, Allah yolunda cihad etmək Cənnətə daxil olmaq üçün bir qapıdır. Allah bu yolla insanı qəm-qüssə və kədərdən xilas edir»*.[189]

Bu üsul və üsullar ruhi xəstəliklərin faydalı müalicəsidir və bu barədə götür-qoy edib buna sidq ürək və ixlasla əməl edənlər üçün psixoloci rahatsızlığının ən böyük dəvasıdır. Qeyd etmək lazımdır ki, bəzi alimlər bir çox ruhi hal və xəstəlikləri bu üsulla müalicə etmiş və Allah tərəfindən faydasını görmüşlər.

## 5. XORA XƏSTƏLİYİ VƏ YARALARIN MÜALİCƏSİ

[188] *Əbu Davud, 4/324; Əhməd, 5/42.*
[189] *Əhməd, 5/314, 316, 319, 326, 330; Hakim. Hədisi Zəhəbi səhih hesab emmişdir, 2/75.*

Əgər hər hansı bir insan bu növ xəstəliklərdən şikayətlənsəydi, yaxud onun bədənində yara və ya xora olsaydı, Allahın elçisi barmağını belə edərək deyərdi. Süfyan Peyğəmbərin *-səllallahu aleyhi və səlləm-* hərəkətlərini göstərmək məqsədilə şəhadət barmağını yerə vurdu, sonra isə qaldırıb belə dedi:

**(( بِسْمِ اللهِ تُرْبَةُ أَرْضِنَا بِرِيقَةِ بَعْضِنَا يُشْفَى سَقِيمُنَا بِإِذْنِ رَبِّنَا ))**

**«Bismilləhi turbətu ardınə bəriqəti bə'dinə yuşfə səqimunə bi-izni rabbinə»** (*Allahın adı ilə! Yerimizin torpağı, bəzilərimizin tüpürcəyi ilə dərdimiz Allahın izni ilə şəfa tapar*).[190]

Hədisin mənası ondan ibarətdir ki, o, şəhadət barmağını öz tüpürcəyi ilə yaşlar, sonra isə onu torpağa sürtərdi. Bəzi qum dənəcikləri onun barmağına yapışardı. Barmağı bədənin yara və ya ağrı olan hissəsinə çəkərək bu sözü deyərdi.

## 6. MÜSİBƏT BAŞ VERDİKDƏ ONUN NƏTİCƏSİNİN ARADAN QALDIRILMASI ÜÇÜN GÖRÜLƏN TƏDBİRLƏR

---

[190] ***Buxari, 10/206; Müslim, 4/1724.***

1. Allah-taala buyurur: **«Yer üzündə baş verən və sizin öz başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o, bir kitabda [lövhi məhfuzda] yazılmamış olsun. Bu, Allah üçün asandır! Bu sizin əlinizdən çıxana kədərlənməməyiniz üçündür. Allah özünü bəyənən, özü ilə fəxr edən heç bir kəsi sevməz!»**[191]

2. Allah-taala buyurur: **«Allahın izni olmadıqca [heç kəsə] heç bir müsibət üz verməz. Kim Allaha iman gətirsə, Allah onun qəlbini haqqa doğru yönəldər və o, dünyada baş verən hər şeyin Allahın əzəli hökmü və izni ilə olduğunu bilər. Allah hər şeyi [keçmişi, indini və gələcəyi] biləndir!»**[192]

3. Allahın elçisi buyurmuşdur: *«Başına bir müsibət gəldiyi zaman:*

**(( إنَّا للهِ وإنَّا إليهِ رَاجِعُونَ اللَّهُمَّ أجُرْنِي فِي مُصِيبَتي واخْلِفْ لِي خَيراً مِنهَا ))**

**«İnnə li-l-ləhi va innə ileyhi raci‘un, Allahummə-‘curni fi musıbəti va əxlif li xəyran minhə»** (Biz Allahın bəndələriyik və [öləndən sonra] Ona tərəf [Onun dərgahına] qayıdacağıq! Allahım, başıma gələn müsibətə görə məni savabla mükafatlandır. Bu

---

[191] *əl-Hədid, 22, 23.*
[192] *əm-Təğabun, 11.*

müsibətin arxasından isə mənə xeyir və mərhəmət bəxş et!) – *deyən elə bir bəndə tapılmaz ki, Allah-taala onu müsibətə dözüm və səbr göstərdiyi üçün savabla mükafatlandırmasın və bu müsibətin arxasından ona xeyir və mərhəmət bəxş etməsin».*[193]

4. Allahın elçisi buyurmuşdur: *«Qulun övladı öldükdə Allah-taala mələklərinə belə deyər: "Qulumun övladının canını aldınızmı?" Onlar: "Bəli" – deyə cavab verərlər. O deyər: "Onun ürəyinin bəhrəsini [məhsulunu] aldınızmı?" Onlar yenə də: "Bəli" – deyə cavab verərlər. O deyər: "Qulum nə dedi?" Mələklər deyərlər: "Sənə həmd etdi və: "***Biz Allahın bəndələriyik və [öləndən sonra] Ona tərəf [Onun dərgahına] qayıdacağıq!***" – dedi". Onda Allah-taala: "Cənnətdə quluma bir ev tikin və adını "Həmd evi" adlandırın!" – deyə onlara əmr edər».*[194]

5. Allahın elçisi buyurmuşdur: *«Allah-taala buyurur: «Bu dünyada sevimlisini [övlad, qardaş və ya ən yaxını olan insan] əlindən aldığım mömin qulum Allahdan əcr və savab dilərsə, onun Mən tərəfdən mükafatı yalnız Cənnət olar».*[195]

---

[193] ***Müslim, 2/633.***
[194] ***Tirmizi, 1/298.***
[195] ***Buxari, 11/242.***

6. Peyğəmbər *-səllallahu aleyhi və səlləm-* oğlu ölən kişiyə belə dedi: *«Məgər sən Cənnət qapılarının birindən daxil olarkən oğlunun səni gözlədiyini istəməzsənmi?».*[196]

7. Peyğəmbər *-səllallahu aleyhi və səlləm-* buyurmuşdur: *«Uca və böyük Allah buyurur ki, qulumu sevdiyi iki şeydən məhrum etməklə imtahana çəkdikdə, səbr etsə [və Allahdan əcr və savab diləsə], onları Cənnətlə əvəz edərəm. Allah-taala burada «sevdiyi iki şey» dedikdə qulun gözlərini nəzərdə tutur».*[197]

8. Allahın elçisi buyurmuşdur: *«Hər hansı bir xəstəliyə yoluxan yaxud əziyyətə məruz qalan elə bir müsəlman tapılmaz ki, ağac öz yarpaqlarını tökdüyü kimi Allah-taala onun da günahlarını bağışlamasın».*[198]

9. Allahın elçisi buyurmuşdur: *«Tikanın, yaxud ondan da ağrılı bir şeyin əziyyətinə məruz qalan elə bir müsəlman tapılmaz ki, onun üçün bir savab yazılmasın və onun bir günahı silinməsin».*[199]

10. Allahın elçisi buyurmuşdur: *«Müsəlmanın düçar olduğu uzun sürən xəstəlik, yorğunluq, azar, hüzn və*

---

***[196] Əhмəd, Nəsəi. Haкiм və İbn Hibban hədisi səhih hesab emмişlər.***
***[197] Buxari, 10/116; Tirмizi, 2/286.***
***[198] Buxari, 10/120; Müsliм, 4/1991.***
***[199] Müsliм, 4/1991.***

*hətta onu kədərləndirən qəm-qüssə belə, onun günahlarının silinməsi üçündür (kəffarəsidir)».*[200]

11. Allahın elçisi buyurmuşdur: *«Həqiqətən mükafatın böyüklüyü bəlanın böyüklüyü ilədir. Əgər Allah-taala bir qövmü sevsə, onu bəla ilə imtahana çəkər. Buna səbr edənə Allahın razılığı, qəzəblənənə isə Allahın qəzəbi vardır».*[201]

12. Allahın elçisi buyurmuşdur: *«...Bəla bəndə günahları silinmiş vəziyyətdə gəzənədək ondan əl çəkməz».*[202]

## 7. HÜZN VƏ KƏDƏRDƏN XİLAS OLMAĞIN ƏLACI

1. Allahın elçisi buyurmuşdur: *«Başına hüzn və qəmli bir iş gəldikdə:*

**(( اللَّهُمَّ إِنِّي عَبْدُكَ، ابْنُ عَبْدِكَ، ابْنُ أَمَتِكَ، نَاصِيَتِي بِيَدِكَ، مَاضٍ فِيَّ حُكْمُكَ، عَدْلٌ فِيَّ قَضَاؤُكَ، أَسْأَلُكَ بِكُلِّ اسْمٍ هُوَ لَكَ، سَمَّيْتَ بِهِ نَفْسَكَ، أَوْ أَنْزَلْتَهُ فِي كِتَابِكَ، أَوْ عَلَّمْتَهُ أَحَدًا مِنْ خَلْقِكَ، أَوِ اسْتَأْثَرْتَ بِهِ فِي عِلْمِ الْغَيْبِ عِنْدَكَ، أَنْ تَجْعَلَ الْقُرْآنَ رَبِيعَ قَلْبِي، وَنُورَ صَدْرِي، وَجَلاَءَ حُزْنِي، وَذَهَابَ هَمِّي ))**

---

[200] ***Müslim, 4/1993.***
[201] ***Tirmizi, 2/286; İbn Majə.***
[202] ***Tirmizi, 2/286; İbn Majə.***

**«Allahummə inni abdukə, ibnu abdikə, ibnu əmətikə, nəsıyəti biyədikə, madın fiyyə hukmukə, adlun fiyyə qada‘ukə, əs‘əlukə bikulli ismin huva ləkə, səmmeytə bihi nəfsəkə, au ənzəltəhu fi kitəbikə, au alləmtəhu əhədən min xalqikə, au istə‘sərtə bihi fi ilmi-l-ğeybi indəkə, ən təc‘alə-l-qur‘anə rabi‘a qalbi, va nura sadri, va cələ‘ə huzni va zəhəbə həmmi»** (Allahım! Mən sənin qulunam. Sənin qulunun və kənizinin övladıyam. Kəklim (ixtiyarım) sənin əlindədir. Barəmdə olan hökmün keçərlidir, mənə qismət etdiyin qəzavü-qədər ədalətlidir. Özünü adlandırdığın, Kitabında nazil etdiyin, yaratdıqlarından birinə öyrətdiyin və ya dərgahındakı qeyb elmində (gizli) saxladığın hər bir adınla Quranı qəlbimin baharı, köksümün nuru, hüznümün ortadan qalxması və kədərimin getməsi üçün bir [vəsilə] etməyini istəyirəm) - *deyən elə bir müsəlman bəndə yoxdur ki, Allah-taala onun hüzn və kədərini aparmasın və onun yerini fərəhlə doldurmasın».*[203]

2. Allahın elçisi tez-tez bu duanı oxuyardı:



[203] *Əhməd, 1/391. Hədisi əl-Albani səhih hesab emмişdir.*

**«Allahummə inni ə‘uzu bikə minə-l-həmmi va-l-həzəni, va-l-kəsəli, va-l-buxli va-l-cübni, va dalə‘i-d-deyni va ğaləbəti-r-ricəl»** (*Allahım! Kədər, hüzn, acizlik, tənbəllik, xəsislik, qorxaqlıq, borclu olmaq dərdindən və düşmənlərin üzərimizdə qələbə çalmasından Sənə pənah aparıram*).[204]

## 8. BƏDBƏXTÇİLİK VƏ SIXINTININ MÜALİCƏSİ

1. Allahın elçisi bədbəxtçilik və sıxıntı zamanı belə deyərdi:

**(( لاَ إِلَـهَ إِلاَّ اللهُ الْعَظِيمُ الْحَلِيمُ ، لاَ إِلَـهَ إِلاَّ اللهُ رَبُّ الْعَرْشِ الْعَظِيمُ ، لاَ إِلَـهَ إِلاَّ اللهُ رَبُّ السَّمَوَاتِ وَرَبُّ اْلأَرْضِ وَرَبُّ الْعَرْشِ الْكَرِيمُ ))**

**«Lə iləhə illə-l-lahu-l-azımu-l-həlim, lə iləhə illə-l-lahu rabbu-l-arşi-l-azım, lə iləhə illə-l-lah rabbu-s-səməvati va rabbu-l-ardı va rabbu-l-arşi-l-kərim»** (*Əzəmətli və həlim (Bəndələrinə əzab verməkdə tələsməyən) olan Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, əzəmətli ərşin Rəbbi olan Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, yerin və kəramətli ərşin Rəbbi olan Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur*).[205]

---

[204] ***Buxari, 7, 158.***
[205] ***Buxari, 7/154; Müslim, 4/2092.***

2. Allahın elçisi bədbəxtçilik və sıxıntı zamanı belə deyərdi:

(( اللَّهُمَّ رَحْمَتَكَ أَرْجُو، فَلاَ تَكِلْنِي إِلَى نَفْسِي طَرْفَةَ عَيْنٍ، وَأَصْلِحْ لِي شَأْنِي كُلَّهُ، لاَ إِلَهَ إِلاَّ أَنْتَ ))

**«Allahummə rahmətəkə ərcu fələ təkilni ilə nəfsi tarfətə ayn va aslıh li şə'ni kulləhu, lə iləhə illə ənt»** (*Allahım! Sənin mərhəmətini diləyirəm. Bir göz qırpımına belə məni öz ixtiyarıma buraxma və bütün işlərimi sahmana sal. Səndən başqa ibadətə layiq haqq məbud yoxdur*).[206]

3. Allahın elçisi bədbəxtçilik və sıxıntı zamanı bu Quran ayəsini oxuyardı:

(( لاَ إِلَهَ إِلاَّ أَنْتَ ، سُبْحَانَكَ ، إِنِّي كُنْتُ مِنَ الظَّالِمِينَ ))

**«Lə iləhə illə ənt subhanəkə inni kuntu minə-z-zalimin»** (*Pərvərdigara! Səndən başqa ibadətə layiq haqq məbud yoxdur. Sən pak və müqəddəssən! Mən isə, həqiqətən, zalimlərdən olmuşam*).[207]

4. Allahın elçisi bədbəxtçilik və sıxıntı zamanı belə deyərdi:

---

[206] ***Əbu Davud, 4/324; Əhməd, 5/42. Hədisi əl-Albani və Əbdülqadir əl-Arnaum yaxşı hesab emmişdir.***

[207] ***əl-Ənbiya, 87; Tirмizi, 5/529. Hədisi Hакім səhih hesab emмiş, Zəhəbi isə bununla razılaşмışdır.***

(( اللهُ اللهُ رَبِّي، لاَ أُشْرِكُ بِهِ شَيْئًا ))

**«Allahu Allahu rabbi, lə uşriku bihi şey‘ən»** (*Allahdır, Allahdır Rəbbim! Heç nəyi Ona şərik qoşmuram!*).[208]

## 9. XƏSTƏNİN ÖZÜNÜ MÜALİCƏ ETMƏSİ

Osman ibn Əbu əl-As əs-Səqafi islamı qəbul etdikdən bəri bədənində əmələ gəlmiş bir ağrıdan Allahın elçisinə şikayətləndi. Allahın elçisi də ona belə dedi: *«Əlini bədənin ağrı olan hissəsinə qoy və üç dəfə:* **(( بِسْمِ اللهِ)) «Bismil-ləh»** (*Allahın adı ilə*), yeddi dəfə isə:

(( أَعُوذُ بِاللهِ وَقُدرَتِهِ مِنْ شَرِّ مَا أَجِدُ وأُحَاذِرُ ))

**«Ə‘uzu bil-ləhi va qudratihi min şərri mə əcidu va uhaziru»** (Hiss etdiyim və qorxduğum [ehtiyat etdiyim] ağrının şərindən Allaha və Onun qüdrətinə pənah aparıram) – *zikrlərini oxu».*[209]

## 10. XƏSTƏNİN ZİYARƏTİ ZAMANI ONUN MÜALİCƏSİ

Peyğəmbər *-səllallahu aleyhi və səlləm-* buyurmuşdur: *«Müsəlman bəndə xəstəni ziyarət edərək yeddi dəfə:*

---

[208] *Əbu Davud, 2/87; "Səhih İbn Majə", 2/335.*
[209] *Müslим, 4/1728.*

(( أَسْأَلُ اللهَ الْعَظِيمَ رَبَّ الْعَرْشِ الْعَظِيمِ أَنْ يَشْفِيَكَ ))

**«Əs'əlu-l-lahə-l-azım rabbə-l-arşi-l-azım ən yəşfiyəkə»** (Əzəmətli ərşin Rəbbi, əzəmətli Allahdan sənə şəfa diləyirəm!)- *deyərsə, xəstə şəfa tapmayınca əcəli çatmaz».*[210]

## 11. YUXUDA NARAHATÇILIQ VƏ DİKSİNMƏYİN MÜALİCƏSİ

Allahın elçisi buyurmuşdur: *«Sizlərdən biri yuxuda diksindikdə:*

(( أَعُوذُ بِكَلِمَاتِ اللهِ التَّامَّاتِ مِنْ غَضَبِهِ وَعِقَابِهِ ، وَشَرِّ عِبَادِهِ، وَمِنْ هَمَزَاتِ الشَّيَاطِينِ وَأَنْ يَحْضُرُونِ ))

**«Ə'uzu bikəliməti-l-ləhi-t-təmməti min ğadabihi va iqabihi, va şərri ibədihi va min həməzəti-ş-şəyatıni va ən yahduruni»** (Allahın qəzəbindən, cəzasından, bəndələrinin şərindən, şeytanın vəsvəsələrindən və onların məni pisliyə sövq etməsindən Allahın mükəmməl və nöqsansız kəlimələrinə sığınıram) – *zikrini oxusun».*[211]

## 12. QIZDIRMANIN MÜALİCƏSİ

[210] *"Səhih Tirмizi", 2/210; Əbu Davud, "Səhih əl-Jaмi", 5/180.*
[211] *Əbu Davud, 4/12; "Səhih Tirмizi", 3/171.*

Allahın elçisi buyurmuşdur: *«Qızdırma Cəhənnəm istisindəndir. Onu su ilə soyudun».*[212]

## 13. SANCMA VƏ DİŞLƏMƏNİN MÜALİCƏSİ

1. Sancılan yerə yüngülcə tüpürməklə əl-Fatihə surəsi oxunulmalıdır.[213]
2. əl-Kafirun, əl-Fələq və ən-Nas surələrini oxumaqla dişlənilən, yaxud da sancılan yerə su və duz çəkilməlidir.[214]

## 14. ƏSƏB XƏSTƏLİYİNİN MÜALİCƏSİ

Əsəb xəstəliyinin müalicəsi iki yolla aparılır.

1. Əsəbləşməkdən qorunmaq:

Təkəbbürlük, eqoistlik, çirkin hərislik, yersiz zarafat, qeyri-ciddilik və insanın əsəbi olmasına gətirib çıxaran bu kimi keyfiyyətlərdən uzaq olmaq əsəb xəstəliyinə tutulmamaq üçün ilkin müalicə üsuludur.

2. Əsəbi olduqdan sonra ona qarşı müalicənin aparılması dörd üsulla həyata keçirilir:

**I.** Allahın rəhmətindən qovulmuş şeytandan Ona sığınmaqla.

**II.** Dəstamaz almaqla.

**III.** Oturmaq, uzanmaq, o yeri tərk etmək, susmaq və bu kimi hərəkətlərlə əsəbi olduğun vəziyyəti dəyişdirmək yolu ilə.

**IV.** Qəzəbi boğmağın mükafatı ilə, qəzəbin aqibətinin yaratdığı məğlubiyyəti, köməksizliyi yada salmaq vasitəsilə.

## 15. QARAÇÖRƏKOTU (QARA ZİRƏ) İLƏ MÜALİCƏ

---

[212] ***Buxari, 10/174; Müslim, 4/1733.***
[213] ***Buxari, 10/208.***
[214] ***əm-Təbərani, "əl-Möjəm əs-Səğir", 2/830.***

Peyğəmbər *-səllallahu aleyhi və səlləm-* buyurmuşdur: *«Həqiqətən qaraçörəkotunda ölümdən başqa hər bir dərd üçün şəfa vardır».*[215] Qeyd etmək lazımdır ki, qaraçörəkotu çox faydalı bitkidir. Allah elçisinin: *«...hər bir dərd üçün şəfa vardır»* - deməsi Allahın: **«O öz Rəbbinin əmri ilə hər şeyi məhv edər!»**[216] - deməsi kimidir. Burada məhv olması mümkün olan bütün şeylər nəzərdə tutulur.

## 16. BALLA MÜALİCƏ

1. Hər şeydən uca və böyük olan Allah bal arısı barədə danışarkən buyurur: **«O arıların qarınlarından insanlar üçün şəfa olan müxtəlif rəngli [ağ, sarı, qırmızı] bal çıxar. Şübhəsiz ki, bunda da düşünüb dərk edənlər üçün bir ibrət vardır!»**[217]

2. İbn Abbasdan rəvayət olunan bir hədisdə Peyğəmbər *-səllallahu aleyhi və səlləm-* buyurmuşdur: *«Şəfa üç şeydədir: həccamın*[218] *neştərində,*[219] *bal içməkdə və [odla] dağlamaqda. Mən isə ümmətimə [odla] dağlamağı qadağan edirəm».*[220]

## 17. ZƏM-ZƏM SUYU İLƏ MÜALİCƏ

1. Allahın elçisi Zəm-zəm suyu barədə belə demişdir: *«Həqiqətən o mübarək [bir nemət], idaların ən yaxşısı və [xəstəliklərin şəfasıdır]».*[221]

---

[215] *Buxari, 10/143; Müslim, 1735.*
[216] *əl-Əhqaf, 25.*
[217] *ən-Nəhl, 69.*
[218] *Qanalma ilə məşğul olan şəxs.*
[219] *Jərrah bıçağı.*
[220] *Buxari, 10/137.*
[221] *Müslim, 4/1922.*

2. Cabirdən nəql olunan hədisdə isə onun belə deməsi bildirilir: *«Zəm-zəm suyu nə niyyətlə içilirsə, o niyyətlə də qəbul olunur».*[222]

3. Peyğəmbər *-səllallahu aleyhi və səlləm-* Zəm-zəm suyunu [qablarda], tuluqlarda[223] gəzdirər, onu xəstələrin üzərinə tökər və onlara içirdərdi.[224] İbn əl-Qeyyim *-Allah ona rəhmət eləsin-* demişdir: «Mən və başqaları Zəm-zəm suyundan şəfa məqsədilə istifadə edərək qəribə işləri təcrübədən keçirdik. Onun vasitəsilə bir neçə xəstəliyimi müalicə etdim və Allahın izni ilə sağaldım».[225]

## 18. QƏLB XƏSTƏLİKLƏRİNİN MÜALİCƏSİ

Qeyd etmək lazımdır ki, qəlblər üç növ olur:

**1. Sağlam qəlb.** Sağlam qəlb elə bir qəlbdir ki, Qiyasmət günü heç kəsin qurtula bilməyəcəyi halda onunla Allahın hüzuruna gələnlər nicat tapacaqlar. Bu barədə Allah-taala Qurani-Kərimdə buyurur: **«O gün ki nə mal-dövlət, nə də övlad bir fayda verər! Ancaq sağlam, təmiz [daxilində şəkk-şübhəyə, küfrə, şirkə və nifaqa yer olmayan] bir qəlblə Allahın Hüzuruna gələn kimsədən [möminlərdən] başqa!»**[226]

Sağlam qəlb Allahın əmr və qadağalarına müxalif olan bütün şəhvətlərdən, xəbərlərinə zidd olan bütün şəkk-şübhələrdən, Allahdan qeyrisinə qul olmaqdan və

---

[222] *“Səhih İbn Majə”, 2/183; “İrva əl-Ğəlil”, 4/320.*
[223] *Su saxlamaq üçün dəridən hazırlanmış qab.*
[224] *Tirmizi; Beyhəqi, 5/202.*
[225] *“Zəd-əl Məad”, 4/178, 393.*
[226] *əş-Şuəra, 88-89.*

Onun elçisinin deyil, ondan qeyrilərinin hökmlərini rəhbər tutmaq kimi bu və ya digər əməllərdən uzaq olan bir qəlbdir. Bir sözlə sağlam qəlb daxilində istənilən şəkildə şirkə yer olmayan bir qəlbdir. Bu qəlb öz iradəsi, məhəbbəti, Allaha təvəkkülü, Onun hüzuruna qayıtması, itaəti, qorxusu və istəyi ilə köləliyini sırf Allaha aid edən qəlbdir. Bu qəlbin daşıyıcısı əməlini sırf Allah üçün edər, sevdikdə Allah üçün sevər, nifrət etdikdə Allah üçün nifrət edər, verdikdə Allah üçün verər, qadağa qoyduqda Allah üçün qadağa qoyar. Onun bütünlüklə kədəri, sevgisi, məqsədi, bədəni, əməlləri, yatması, qalxması və söhbəti Allah eşqinədir. Allah-taala barədə edilən söhbət ona digər söhbətlərdən daha şirindir. Həmçinin Allah haqqında fikirləşmək Onun rizasını və sevgisini qazanmasına gətirib çıxarır. Biz də Allahdan belə bir qəlbi diləyirik.

**2. Ölü qəlb.** Bu qəlb sağlam qəlbin tam əksidir. Belə ki, bu qəlb öz Rəbbini tanımaz, ona əmr olunan ibadəti yerinə yetirməz, Onun əmrlərini sevməz və onlardan məmnun olmaz. Əksinə, o şəhvət və ləzzətlərə qapılıb qalan bir qəlbdir. Əgər bu şəhvət və ləzzətlər barədə Allahın qəzəbi varsa, onda bu qəlb sevə-sevə, kiminsə görməsindən qorxaraq, istəklə, məmnunluqla, edə bilməməsinə qəzəblənərək, tutduğu əməlləri böyük bir

iş hesab edərək və bu şəhvətlər qarşısında zəlil olmuş bir vəziyyətdə Allahdan qeyrisinə ibadət etmiş olur. Belə bir qəlbin daşıyıcısının kimə isə nifrət və ya sevgi bəsləməsi yalnız onun öz ehtiraslarından doğan hisslərdir. Belə ki, nəfsi imamıdır, şəhvəti rəhbəridir, cəhalət sürücüsüdür, qəflət miniyidir. Biz də belə bir qəlbin daşıyıcısı olmaqdan Allaha sığınırıq.

**3. Xəstə qəlb.** Bu qəlb diri və xəstəliyi olan qəlbdir. Onun iki ünsürü vardır ki, bəzən biri, bəzən də digəri ona öz təsirini göstərir və bunlardan biri digərinə üstün gəlir. Bu maddələrin birində Allah-taala məhəbbəti, Ona iman gətirmək, Ona qarşı ixlaslı olmaq və Ona təvəkkül etmək kimi keyfiyyətlər öz əksini tapır. Bu da onun yaşama cövhəridir. Onun həlak və şikəst olması ilə nəticələnən digər cövhər isə şəhvətlər, onların əldə olunması üçün həriscəsinə cəhd etmək, həsəd, təkəbbürlük, eqoistlik, şan-şöhrət hərisliyi, hökmdarlıqla yer üzündə fitnə-fəsad törətmək, münafiqlik, insanların nəzər-diqqətini özünə cəlb etməyə çalışmaq, xəsislik və paxıllıq kimi keyfiyyətləri özündə əhatə edir. Belə bir qəlbdən Allaha pənah aparırıq.

Qəlbin bütün xəstəliklərdən müalicə yolları Qurani-Kərimdə öz əksini tapmışdır. Bu barədə Allah-taala buyurur: **«[Ey insanlar!] Sizə Rəbbinizdən bir öyüd-**

**nəsihət, ürəklərdə olana [cəhalətə, şəkk-şübhəyə, nifaqa] bir şəfa, möminlərə hidayət və mərhəmət [Quran] gəlmişdir!»,**[227] **«Biz, Qurandan möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik. O, zalimlərin [kafirlərin] ancaq ziyanını artırır».**[228]

***Qəlb xəstəlikləri iki növdən ibarətdir:***

Birinci xəstəliyin elə bir növüdür ki, daşıyıcısı bu xəstəliyin mövcudiyyətindən heç bir əziyyət çəkmir. Bu cəhalət və şəkk-şübhələr xəstəliyidir. Əslində isə bu xəstəliklər ağrı baxımından ən böyük xəstəliklərdir, lakin qəlbin xarablığı onun daşıyıcısına bunu duymağa imkan vermir.

Xəstəliyin digər növü isə qəm-qüssə, hüzn, qəzəb kimi faktiki olaraq əziyyət verici xəstəliklərdir. Belə xəstəliklər və onların baş vermə səbəbləri təbii dava-dərmanlar vasitəsilə aradan qaldırılır.

***Qəlbin müalicəsi dörd üsul əsasında həyata keçirilməlidir:***

**I. Qurani-Kərim vasitəsilə.** Həqiqətən Quran qəlblərdə olan şəkk-şübhələrə bir şəfadır. O, ürəklərdə olan şirki, küfr ləkəsini, şübhə və şəhvət xəstəliklərini yox edəndir. Quran haqqı bilib ona əməl edənlər üçün

---

[227] *Yunus, 57.*
[228] *İsra, 82.*

bir yol, möminlərin dünya və axirət savablarını əldə etmələri üçün isə bir rəhmətdir. **«Heç [küfrlə] ölü olub diriltdiyimiz, sonra insanlar arasında gəzmək üçün özünə bir nur [islam dinini] verdiyimiz adam zülmət içində qalıb oradan çıxa bilməyən şəxs kimi ola bilərmi?»**[229]

**II.** Qeyd etmək lazımdır ki, qəlb üç şeyə möhtacdır.

1. Qəlbin güclü olması qorunmalıdır. Bunun da həyata keçirilməsi iman, əməlisaleh və müstəhəb əməllər vasitəsilə mümkündür.

2. Qəlb bütün böyük və kiçik günahlardan uzaq tutularaq hər bir zərərli amillərdən qorunmalıdır.

3. Tövbə etmək və günahların bağışlanmasını diləməklə bütün zərərli şeylərdən kənar olmalıdır.

**III.** Qəlbi nəfsin ona hökmranlıq etməsi kimi dərdən xilas etmək lazımdır ki, bunun da iki müalicə yolu vardır: insan öz əməlləri barədə özünə hesabat verməli və nəfsin ona əmr etdiklərinə müxalif olmalıdır.

a) İşin icra olunmasından öncəki növ dörd məqamdan ibarətdir:

1. Bu işi etməyə gücü çatarmı?

2. Bu işin icrası onun üçün icra olunmamasından xeyirlidirmi?

---

[229] ***əl-Ənam, 122.***

3. Bu işi Allahın rzılığını qazanmaq üçünmü edir?

4. Bu işin köməyə ehtiyacı olduğu təqdirdə ona kömək edəcək qüvvələr vardırmı? Əgər verilən bütün bu suallara müsbət cavab tapılarsa, onda işin icrasına girişmək olar. Əks halda isə heç vaxt onun icrasına başlamaq olmaz.

b) İşin icrasından sonrakı növ aşağıdakı qismlərə bölünür:

1. İbadəti yerinə yetirərkən onda Allah-taalanın haqqını azaltdığı və onu lazımi şəkildə yerinə yetirmədiyi üçün özü ilə hesablaşmalıdır. Allaha ixlasla ibadət etmək, yalnız Onun rizası naminə insanlara nəsihət vermək, ibadətlərdə mütəmadilik, xeyirxah işlərdə iştirakçı olmaq, Allah-taalanın ona bəxş etdiyi nemətləri görmək, etiraf etmək və bundan sonra bu haqları tam yerinə yetirmədiyini etiraf etmək Allah-taalanın haqlarındandır.

2. Onun üçün tərk edilməsi yerinə yetirilməsindən xeyirli olan etdiyi hər bir iş üçün özü ilə hesablaşmalıdır.

3. Etmədiyi halal, yaxud adi bir iş üçün özü ilə hesablaşmalıdır. O bununla Allah-taalanı və axirət dünyasını istəyibsə, bu onun üçün gəlirli və xeyirli

olar. Yox əgər bununla fani dünyanı istəyibsə, bu onun üçün zərərli olar.

Bir sözlə, insan ilk növbədə vacibatlar barədə özü ilə hesablaşmalı və əgər çatışmamazlıq varsa, onu tamamlamalıdır. Sonra qadağalar barədə özü ilə hesablaşmalı və onlardan birini törətdiyini bildiyi təqdirdə tövbə etməklə və bağışlanma diləməklə səhvini düzəltməlidir. Sonra bütün varlığı [bütün əzalarının iştirakı ilə], daha sonra isə bilmədən etdiyi əməllər barəsində özü ilə hesablaşmalıdır.

**IV.** Qəlbi şeytanın ona hökmranlıq etməsi kimi dərdən xilas etmək.

Şeytan insanın düşmənidir. Ondan xilas olmaq üçün Allah-taalanın təyin etdiyi sığınmalarla ondan Allaha pənah aparmaq lazımdır. Qeyd etmək lazımdır ki, Peyğəmbər *-səllallahu aleyhi və səlləm-* nəfsin şərindən sığınmaqla şeytanın şərindən sığınmağı bərabər tutmuş və Allahın elçisi Əbu Bəkrə belə demişdir: *«De:*

**(( اللَّهُمَّ عَالِمَ الْغَيْبِ وَالشَّهَادَةِ ، فَاطِرَ السَّمَوَاتِ وَالْأَرْضِ ، رَبَّ كُلِّ شَيْءٍ وَمَلِيكَهُ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ أَنْتَ ، أَعُوذُ بِكَ مِنْ شَرِّ نَفْسِي ، وَمِنْ شَرِّ الشَّيْطَانِ وَشِرْكِهِ ، وَأَنْ أَقْتَرِفَ عَلَى نَفْسِي سُوءًا ، أَوْ أَجُرَّهُ إِلَى مُسْلِمٍ ))**

**«Allahummə alimə-l-ğeybi va-ş-şəhadəti, fatıra-s-səməvati va-l-ardı, rabbə kulli şey‘in va məlikəhu,**

**əşhədu ən lə iləhə illə ənt, ə‘uzu bikə min şərri nəfsi, va min şərri-ş-şeytani va şirkihi, va ən əqtərifə alə nəfsi su‘an, au acurrahu ilə muslim»** (Allahım! Ey səmaları və yeri yaradan, qeybi və aşkarı bilən, hər şeyin Rəbbi və ixtiyar sahibi! Şəhadət verirəm ki, Səndən başqa ibadətə layiq haqq məbud yoxdur. Nəfsimin şərindən, şeytanın şərindən və şirkindən, özümə, yaxud bir müsəlmana pislik etməkdən Sənə pənah aparıram). *Bunu səhər-axşam və yatanda de».*[230]

Allaha sığınmaq, Ona təvəkkül etmək və Ona qarşı ixlaslı olmaq şeytanın qəlblərə hakim olmasına mane olan amillərdir.

Sonda qulu və elçisi olan Məhəmmədə -*səllallahu aleyhi və səlləm*-, onun ailəsinə, əshabələrinə və Qiyamətə qədər onun yolunu layiqincə davam etdirənlərə Allahın salamı və xeyir-duası olsun deyirəm.

---

[230] ***əm-Tirмizi, 3/142; Əbu Davud.***

## MÜNDƏRİCAT

